*Bu kitab "**Molla Pənah Vaqif. Əsərləri**" (Bakı, Azərnəşr, 1968) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni və ön sözün müəllifi: Həmid Araslı

**894.3611 - dc 21**
**AZE**

***Molla Pənah Vaqif. Əsərləri***. Bakı, "Şərq-Qərb", 2004, 264 səh.

XVIII əsr Azərbaycan ədəbiyyatının ən görkəmli nümayəndəsi, heç şübhəsiz, Molla Pənah Vaqifdir. Vaqif yaradıcılığı ilə xalq şerinin təsiri yazılı ədəbiyyatımızda üstünlük qazanır. Vaqif poeziyası əsrin ziddiyyətlərini, sevinc və kədərini daha parlaq ifadə etdiyi üçün bütünlükdə Azərbaycan milli ədəbiyyatının bu dövrünü Vaqif əsri adlandırmaq olar. Zamanın qabaqcıl ideyalarının, zövqü və əhvali-ruhiyyəsinin ən yaxşı ifadəçisi olan Vaqif şeri ilə ədəbiyyatımızda yeni mərhələ başlayır. Əlyazmalar əsasında, cünglərdən istifadə edilməklə tərtib olunmuş bu kitabda böyük şairin qoşma, təcnis, qəzəl, müxəmməs və s.-dən ibarət əsərləri toplanmışdır.

ISBN 9952-418-01-6

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ŞERİMİZİN FƏXRİ

Gözəl şeir öz təravətini heç bir zaman itirmir. Əsrlər keçir, nəsillər birbirini əvəz edir, əsil sənət əsəri olan şeirlər həmişə dodaqlarda səslənir, ürəklərə təsir edir, dillərdə əzbər olaraq yaşayır. Belə şeirlərin tərif və təbliğə ehtiyacı yoxdur. Onlar cap olunmasalar da, öz ömürlərini ecazkar bir qüdrətlə uzadırlar. Elə bil sözlərin sehrkar quruluşu onlara yeni həyat və qüvvət verir. Əsrlərin imtahanından çıxıb unudulmayan belə əsərlər klassik irsimizin ən gözəl nümunələridirlər. Molla Pənah Vaqif də (1717-1797) öz təravətini əsrlərcə yaşadan klassik şerimizin ölməz nümunələrini yaratmış sənətkarlardan biridir.

Vaqif öz ədəbi və siyasi fəaliyyətilə xalqla bağlı mütərəqqi şəxsiyyətlərdən biri olduğu kimi, Azərbaycan ədəbiyyatının yeni istiqamətdə inkişafına kömək etmiş qüdrətli bir sənətkardır.

Vaqif 1717-ci ildə Qazax mahalının Qıraq Salahlı kəndində anadan olmuşdur. Şairin əsl adı Pənah, atasının adı isə Mehdi ağadır. Lakin sonralar Vaqif məktəbdar olduğu üçün Molla Pənah adı ilə xalq arasında tanınır.

1759-cu ildə Gürcüstan sərhəddində baş verən qarışıqlıqlar nəticəsində Qazax mahalının bir neçə ailəsi kimi Vaqifin ailəsi də doğma yurdlarını tərk edib Qarabağ xanlıqlarına köçməyə məcbur olur. Vaqif burada da məktəbdar kimi calışır. O, məktəbdə çalışdığı vaxt, eyni zamanda şeirlər də yazaraq yavaş-yavaş məşhurlaşır. Bu dövrün məhsulu olan əsərlərində şairin maddi və mənəvi sıxıntıları da öz əksini tapmışdır. Bu cəhətdən “Bayram oldu” qoşmasını misal göstərmək olar.

Vaqif sonra Şuşa şəhərinə köçərək, orada məktəb açıb köhnə peşəsini davam etdirir. Lakin bu zaman Vaqifin şairlik şöhrəti hər tərəfə yayılmış idi.

İstedadlı şair eyni zamanda hazırcavab, savadlı bir alim kimi də şöhrətlənmişdi.

Şairin şöhrətini eşidən Qarabağ hökmdarı İbrahim xan onu saraya dəvət edib, eşik ağası, yəni daxili işlər üzrə vəzir təyin edir. Lakin Vaqif az bir müddət ərzində öz ağıl və istedadı ilə böyük nüfuz qazanır, xanlığın bütün daxili və xarici işlərini öz əlinə alır və təxminən 27 il müddətində sarayın ən mötəbər adamlarından biri kimi tanınır. Tarixi məxəzlərdən Vaqifin Qarabağ xanlığının möhkəmlənməsi uğrunda çalışan bacarıqlı bir dövlət xadimi olması anlaşılır. Xüsusən xanlığın mərkəzi şəhərinin abadlaşdırılmasında və təmiri işlərində onun böyük rolu olmuşdur.

Məlumdur ki, Vaqif dövründə Azərbaycan bir sıra xanlıqlara ayrılırdı. Vaqif bacarıqlı bir dövlət xadimi kimi bu parçalanmanın ölkənin mədəni-

iqtisadi inkişafına ciddi maneə olduğunu anlayır və var qüvvəsi ilə xanlıqları birləşdirməyə can atırdı. Lakin bu mümkün olmadığı şəraitdə ölkənin təhlükəsizliyini təmin etmək üçün şair Rusiya ilə olan əlaqələri daha da möhkəmlətməyə başlayır. Bu zaman Irandan Ağa Məhəmməd şah Qacar tərəfindən gözlənilən təhlükəni hiss edən Vaqif ölkəni müdafiəyə hazırlaşır, bu məqsədlə qonşu dövlətlərlə ittifaq bağlayır, Rusiya ilə siyasi əlaqələri möhkəmləndirirdi.

Məhz Vaqifin belə bir siyasi fəaliyyəti nəticəsi olaraq Qarabağ xanlığı Şuşa qalasını Qacarın hücumundan müdafiə edib qoruya bilir.

Lakin Qarabağ xanlığı Qacarın ikinci hücumunu dəf etməyə müvəffəq ola bilmir. Buna həm Rusiya ordularının uzaqlaşması, həm də ölkədə baş verən fəlakət imkan vermir. 1797-ci ildə Şuşa qalasını işğal edən Qacar Vaqifi də zindana saldırır. Lakin Vaqif, Qacarın öldürülməsi ilə əlaqədar olaraq həbsdən qurtarır. Bu münasibətlə yazılan “Ey Vidadi, gərdişi-dövrani-kəcrəftarə bax” misrası ilə başlayan qəzəlində şair həmin məsələyə toxunmuşdur.

Ağa Məhəmməd şah Qacarın məğlubiyyətindən sonra İbrahim xanın qardaşı oğlu Məhəmməd bəy Çavanşir xanlığı öz əlinə alır. Təzə Qarabağ xanı əmisinin bütün yaxın adamları kimi Vaqifə də pis münasibət bəsləyir və onu öldürmək üçün bəhanə axtarır. Bu zaman Vaqifin vəziyyəti daha da ağırlaşır.

Şairin “Görmədim” müxəmməsi də onun keçirdiyi belə ağır zamanlarda qələmə alınmışdır. Nəhayət , Vaqif İbrahim xanın dalısınca qasid göndərib yazdığı məktubda xandan tez qayıtmasını xahiş edir. Lakin məktubu aparan qasid tutulur və Vaqifin xana yazdığı həmin məktub ələ keçir. Məhəmməd bəy Çavanşir 1797-ci ildə şairi oğlu Əli ağa ilə birlikdə Şuşa şəhərində öldürtdürür. Bütün həyatını xalqla, vətənə xidmət işinə sərf etmiş, xalqıyla yaxından bağlı bir yaradıçılığa malik şairin həyat yolu belə faciə ilə bitir. Vaqif edam edildikdən sonra onun evi talan olunur. Bütün bunlar Vaqif irsinin bizə qədər gəlib çatmamasına səbəb olur. Talan zamanı şairin əsərlərinin çox hissəsi itib-batmış , divan və əlyazmaları məhv olmuşdur. Lakin xalq sevimli şairinin şeirlərini hafizələrində yaşatmış, müxtəlif vasitələrlə Vaqifin əsərlərinin müəyyən qismini mühafizə etməyə müvəffəq ola bilmişdir. Vaqif yaradıcılığının hafizələrdə qalan və ədəbiyyat maraqlıları tərəfindən köçürülüb saxlanılan ayrı-ayrı nümunələri bizə çata bilmişdir.

Vaqif yaradıcılığı lirik poeziyanın artıq müəyyən inkişaf yolu keçib formalaşmaqda olduğu bir dövrə təsadüf edir. Vaqif isə formalaşmaqda olan lirik şeri yeni realist inkişaf yoluna salaraq, onu xalq ruhuna, xalq zövqünə yaxınlaşdırmış, özünə qədərki fərqli bir yolla istiqamətləndirmişdir.

Vaqif yaradıcılığı ilə Azərbayçan şeri tarixində yeni bir dövr başlanır. Vaqif lirikası ilə poeziyada yeni bir səhifə açılır, poeziyamızda nikbin bir əhvali-ruhiyyə, həyati və dünyəvi gözəlliyə pərəstiş hissləri qüvvətlənir. Realist şerin ilk nümunələri onun adı ilə bağlıdır.

Vaqif yüksək zövq, incə hisslər, dərin və nikbin duyğular şairidir. Onun yaradıcılığında məhəbbət lirikası əsas yer tutur. Klassik şerimizin əsas mövzusu olan gözəllik şairin lirik qoşmalarında yeni bir məna, yeni bir təravət kəsb edir. Aşıq şerimizdən gələn yüksək dünyəvilik Vaqif lirikasında istiqamətverici rol oynayır. Onun qələmə aldığı gözəllər bütün xarici məlahəti və daxili zənginliyi ilə təsvir edilir.

Vaqif, qoşmalarının mühüm hissəsini gözəlliyin təsvirinə həsr etmişdir.

Bu əsərlərdə təsvir olunan “sərv qədli”, “mina boylu,” “zülfü ənbər”, “şəkər göftarlı “ gözəllər eyni zamanda gözəl yerişi, gözəl duruşu, gözəl rəftar və danışığı ilə də şairin ruhunu oxşayan real insanlardır.

Oturuşun gözəl, duruşun gözəl,
Sallanışın gözəl, yerişin gözəl,
Xoyun, xülqün gözəl, hər işin gözəl,
Bəxş olub bu xubluq xudadan sənə.

Xarici gözəlliyin təsviri şairin şeirlərində əsas yer tutur.

Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan, Pəri. –

deyərək təbii insan gözəlliyindən bəhs edən Vaqif sadə, həyati təşbihlər vasitəsilə təsvir etdiyi gözəli oxucunun gözü qarşısında məharətlə canlandıra bilir.

Üzün ağ, dəyirmi, gözün məstana,
Baxışın bağrımı döndərdi qana.
Ağzın sədəf, dişlərindir dürdana
Əcayib cəvahir lə’li sevmişəm.

Halqalanır zülfün buxaq yanında,
Yay qaşların ucu qulaq dalında,
Zənəxdan içində yanaq yanında
Qara telli bir xətalı sevmişəm.

Vaqifin gözəlin portretini yaratmasını şairin başqa bir şerində belə müşahidə edirik.

Zülflərin sünbüldür, yanağın lalə,
Baxışı tə’n edir vəhşi qəzalə,

Gözləri məstanə, ağzı piyalə,
Gərdəni minadır mənim sevdiyim.

Boyu yaraşıqlı sərvi xuraman,
Əndamıdır ağ gül, sinəsi meydan
Kələğayı gülgəz, libası əlvan,
Bir güli-rə’nadır mənim sevdiyim.

Vaqif, qoşmalarında qadın gözəlliyindən bəhs edərkən vəfa, sədaqət, təmizlik kimi sifətləri bu gözəlliyin ayrılmaz hissəsi olaraq götürür, elmli, mərifətli qadınları tərifləyir.

Özgə ilə hərgiz olmaya işi,
Qafiyə qəzəldən həm çıxa başı,
Bulaqtək qaynaya həm gözü, qaşı
Artıq ola həm kəmalı gözəlin.

Buradan aydın olur ki, Vaqif gözəllikdən danışarkən təkcə zahiri keyfiyyətlərlə kifayətlənmir. O, qadınları mənəvi cəhətdən gözəl, həyalı, abırlı, incə zövqə malik insanlar kimi görmək istəyir.

Vaqif qadının mənəvi gözəlliyindən bəhs edərkən bəzən müasirlərindən fərqlənməyən məhdud görüşlərə də yol verir. O, bəzən qadınlara yalnız aşiqinin zövqünü oxşayan müti bir məxluq kimi yanaşır. Bu ruhda olan şeirlərində Vaqif qadınları yalnız özünə ziynət verməklə məşğul olan, hər cür fəaliyyətdən kənarda, yalnız öz xarici görkəmi haqqında düşünən məşuqə kimi görmək istəyir. Mühitin təsirindən irəli gələn belə xüsusiyyətlər Vaqif yaradıcılığının məhdud cəhətləri kimi qiymətləndirilməlidir.

Vaqif şeirlərində şairin həyata optimist baxışından doğan şad bir əhvali-ruhiyyə, nikbin ruh əsas yer tutmaqdadır. Onun həyatın qədrini bilməyə, onun nemətlərini qənimət saymağa çağıran əsərlərində həyati gözəllikləri dərindən duyub, bütün bunlardan həzz almağı bacaran incə zövqlü bir şair ruhu hakimdir.

Onun əsərlərində Azərbaycan xalqının adət və ənənələri, yerli və məhəlli xüsusiyyətləri özünün parlaq əksini tapmışdır. Böyük şairin yaradıcılığında ruh yüksəkliyi və həyata bağlılıq əsas motivlərdən biridir. O, xalqdan qüvvət almış, xalq ədəbiyyatının nikbin əhvali-ruhiyyəsindən qidalanmışdır.

Şairin həyata nikbin baxışını ifadə edən əsərləri içərisində onun Vidadi ilə deyişməsi daha səciyyəvidir. Həyata bağlı olan şair hətta qarşılaşdığı çətinlikləri belə toy-bayram hesab edir, həyatın hər anından bacarıqla istifadə edib, nəşə ilə ömür sürməyi məsləhət görür.

Toy-bayramdır bu dünyanın əzabı,
Ağlı olan ona gətirər tabı.

LakinVaqifə xas olan bu ruh yüksəkliyi şairin bütün yaradıcılığı boyu davam etmir. Həyatın son illərində qarşılaşdığı ağır şərait şairin şəxsi əhvaliruhiyyəsində də təsir etməyə bilmir. Bu isə şairin yaradıcılığında kəskin dönüş yaranmasıyla nəticələnir. Həmin illərin məhsulu olan əsərlərin ruhunda ciddi dəyişiklik özünü göstərir. Bu zaman şairin yaradıcılığında ictimai motivlər, həyatın, zamanın gərdişindən şikayət öz əksini tapır. Həyatının son illərində yazdığı "Bax" rədifli qəzəli və "Görmədim "müxəmməsində şair həyatın keşmə keşlərində müəyyən acı təcrübəsi olan, çərxi-dövranın ədalətsiz gərdişindən narazı bir insan kimi şikayətlənir. Əvvəl yazılan əsərlərdən fərqli olaraq bu şeirlərdə dərin hüzn, kədər, bədbin bir əhvali-ruhiyyə özünü göstərir.

Şair Vidadiyə yazmış olduğu "Bax"rədifli qəzəlində dostuna müraciətlə "Gərdişi-dövranın kəc rəftarından" ibrət götürməyə, həyatda baş verən bu cür gözlənilməz hadisələrdən dərs almağa çağırır.

Ey Vidadi, gərdişi-dövrani-kəc rəftarə bax
Ruzigara qıl tamaşa, karə bax, kirdarə bax!
Həmin şeirdə Vaqif dostuna müraciət edərək
Baş götür bu əhli aləmdən ayaq tutduqca qaç,
Nə qıza, nə oğula, nə dusta, nə yarə bax!
– deyir.

Vaqifin Vidadiyə müraciətlə dediyi bu sətirlər onun bundan bir qədər əvvəl həmin dostu ilə deyişərkən dediyi:

Say qənimət diriliyin dəmini,
Keçən həmdəmlərin çəkmə qəmini,
Ağlın olsun sil gözünün nəmini,
Dəxi geri gəlməz onlar, ağlarsan! –

misralarından mənaca nə qədər fərqlidir. Eyni şəxsə müraciətlə söylənilən bu şeirlərin ruhunda aydın görünən ziddiyyət Vaqifin dünyagörüşü və yaradıcılığında olan kəskin dönüşün ifadəsi idi.

Vaqif yaradıcılığındakı bu dönüşü aydın ifadə edən başqa bir əsər isə onun "Görmədim" müxəmməsidir. Şairin ictimai məzmunlu əsərləri içəri-

sində mühüm yer tutan bu müxəmməsi Vaqif Məhəmməd bəy Cavanşirin hakimiyyəti illərində qələmə almışdır. Burada yaşadığı mühitdə həddindən artıq ədalətsizliklərə məruz qalan şairin etirazları, zəmanəsindən şikayətləri ifadə olunur.

Vaqif bu müxəmməsi yaşadığı mühitin və cəmiyyətin başdan ayağa qədər haqsızlıq üzərində qurulduğunu kəskin ifşa edən aşağıdakı beytlərlə başlayır:

Mən cahan mülkündə mütləq doğru halət görmədim,
Hər nə gördüm əyri gördüm, özgə babət görmədim.

Bu sətirlər Vaqifin ədalətsizlik hökm sürdüyü bir cəmiyyətə olan etirazı, yaşadığı mühitə qarşı kəskin ittihamı idi. Daha sonra isə şairin həmin cəmiyyətin ayrı-ayrı nümayəndələrinə, sultanlara, dərvişlərə, ədalətsiz bəylərə, din xadimlərinə və sədaqətsiz dostlara olan sonsuz nifrəti ifadə olunmaqdadır:

Nəfs əmmarə əlində sərbəsər olmuş əsir,
Həqqi batil eyləmişlər, işlənir cürmi kəbir,
Şeyxlər şəyyad, abidlər əbusən qəmtərir,
Hiç kəsdə həqqə layiq bir ibadət görmədim.

Belə bir zamanda qədirbilməz insanlarla əhatə olunduğunu qeyd edən şair eylədiyi yaxşılıq əvəzinə həmişə pislik gördüyünü söyləyir, dostluq etdiyi insanların ədavətindən şikayətlənərək:

Bulmadım bir dost kim, ondan bir ədavət görmədim. – deyir.

Cəmiyyətin özbaşınalığı, qanunsuzluq və ədalətsizlikləri ifşa edən bu şerində şair

Müxtəsər kim böylə dünyadan gərək etmək həzər! – deyərək bütün bunlara qarşı etiraz və nifrətini yekunlaşdırır.

Qeyd edildiyi kimi, bu əsər şairin Məhəmməd bəy Cavanşir tərəfindən gördüyü haqsızlıqların təsirilə qələmə alınmışdır. Lakin şeirdən aydın hiss olunur ki, Vaqif təkcə öz şəxsi narazılıqlarını ifadə etməklə kifayətlənmir, burada haqsızlıq üzərində qurulmuş ağıllı adamları zillətdə saxlayıb, alçaqları mötəbər hesab edən cəmiyyətin ədalətsizliyi, xanların şöhrət, hakimiyyət üçün apardıqları müharibə və qanlı siyasətə qarşı xalq etirazının ümumiləş-

dirilmiş bədii ifadəsi verilmişdir. Vaqifin şeirləri öz şəkli xüsusiyyətləri etibarilə də yenidir. Onun əsərlərində, xüsusən qoşmalarında dil son dərəcə bədii, canlı və sadədir.

Vaqif nə qədər şəhər mühitində yazıb yaratsa da, onun şeirlərində elat həyatından alınmış, kənddən gələn ifadələr daha mühüm yer tutur. O, "Quran oxuyan", "üstündən, başından ənbər qoxuyan", "əli polad iynəli" şəhər qadınlarını təsvir etsə də, bənzətmələri, təşbih və istiarələri kəndlə, kənd təbiəti ilə bağlıdır.

Şair gözəl saydığı hər şeyi həyatla, təbiət zənginlikləri ilə müqayisədə verir. Beləliklə, şairin gözəllik meyarı kənd təbiətidir. Odur ki, onun

İxtilatı şirin, sözü məzəli,
Ellər yaraşığı, ölkə gözəli. –

adlandırdığı gözəllər yaşılbaş sonaya, sərxoş ceyrana bənzədilən, "gül bədən", "qönçə ağız", "kəklik yerişli", "maral baxışlı", "sona sığallı", "şahmar saçlı" qızlardır ki, bu sifətlərin hamısı kənddən, xalq ədəbiyyatından gəlir. Məhz buna görədir ki, Vaqif yaradıcılığı öz növbəsində şifahi xalq ədəbiyyatına da qüvvətli təsir göstərmişdir. Onun əsərləri hələ XVIII əsrdən başlayaraq aşıqlar və xanəndələr tərəfindən məclislərdə, yığıncaqlarda oxuna-oxuna davam etməkdədir.

Aşıqlar, xalq şairləri Vaqif irsini məhəbbətlə sevib onun yaradıcılığını yüksək qiymətləndirmişlər. Hələ şairin müasiri olan Aşıq Əli ona xitabən yazdığı şeirdə Vaqif yaradıcılığını belə qiymətləndirir:

Bu əsrdə şairlərin xanısan,
Müdərrisə bərabərsən yəni sən.
Lütfün mədənisən, fəzlin kanısan
Eşidənlər sözün səminə gəlmiş.

XIX və XX əsr aşıqlarının çoxu Vaqifin mövzularını təkrar etmiş, onun kimi qoşmalar yaratmağa çalışmış, onun qafiyələrini, rədiflərini və bədii ifadələrini dönə-dönə işlətmişlər. Xüsusən Aşıq Ələsgərdən sonra məşhur ustad aşıq kimi tanınan Bozalqanlı Aşıq Hüseynin yaradıcılığında Vaqifin qüvvətli təsiri hiss edilir. Onun qoşmaları içərisində Vaqifin misralarına çox rast gəlmək olur.

Şifahi xalq şeirindən gələn və Vaqifin yaradıcılığında yüksək bir zirvəyə qalxan həyatsevərlik XVIII əsr Azərbaycan poeziyasının ən böyük nailiyyəti və üstünlüyüdür.

Vaqif şeir dilimizi ərəb, fars tərkiblərindən, müəmmalı ifadələrindən təmizləyərək canlı xalq dilinin obrazlı ifadələrindən istifadə etmək yolu ilə

sadələşdirmiş və zənginləşdirmişdir. Vaqifin poeziya dilimizə gətirdiyi yeniliklər bu günə qədər realist şerimizin inkişafı üçün əsas bir zəmin olmuşdur.

Məhz buna görə də Vaqif şerinin realist istiqamətini görən M.F.Axundov Vaqif poeziyasındakı realizmə olan belə meyli yüksək qiymətləndirmişdir.

Firudin bəy Köçərli isə onu milli şair adlandıraraq yazırdı: "Onun şeir və qəzəliyyatı bizim Azərbaycan türklərinə ziyadə xoş gəlir və hər nə onun qələmindən zühura gəlibsə... tamamisi ürəkdən və həqiqi həyatdan nəşət edən əsərlərdir. Milli şairlərimizdən onun kimi sadə və açıq lisanda və ana dilimizin şivəsində şeir və qəzəl yazan az olub".

Vaqif özündən sonra gələn şerimizin inkişafına qüvvətli təsir göstərmişdir.

Şairin əldə olan şeir inciləri də onun zəngin yaradıcılığı haqqında geniş danışmaq üçün imkan verir. Vaqif şerinin böyük həyati qüvvəsini hiss edib ədəbiyyatımızın inkişafına göstərdiyi qüvvətli təsiri yüksək qiymətləndirən Firudin bəy Köçərli həsrətlə yazırdı: "Hərgah Vaqif və Vidadi kimi məşhur şairlər özgə millətlər arasında zühur etmiş olsaydılar, bişübhə indiyə kimi onların asar və əşari dəfəat ilə çapdan çıxıb əbnayi-millət içərisində yayılmışdı.

Onların qəbri üstündə nişangah qoyulmuşdu və vəfatlarının əlli və yüz sənəlik yubileyisi yomi alisi artıq cəlal və təntənə ilə yad olunmuşdu."

Şairin abidəsi Azərbaycanın gözəl paytaxtında xalqımızın görkəmli sənətkarları sırasında əzəmətlə dayanır.

Vaqif irsi hələ şairin yaşadığı dövrdə diqqəti cəlb etmişdir. Vaqifin əsərləriilk dəfə bir kitab şəklində toplanaraq 1856-cı ildə Teymurxanşurada "Vaqif və sair müasiri" adı altında çap etdirilmişdir.

Sonralar Vaqifin əsərlərini M.F.Axundov çap etdirmək istəmişdir. Axundovun topladığı materiallardan istifadə edən Adolf Berje həmin əsərləri 1867-ci ildə Leypsiqdə nəşr etdirmişdir. Vaqifin əsərlərini M.F.Axundovun tapşırığı ilə Hüseyn Əfəndi Qayibov toplamağa çalışmışdır. Lakin onun topladığı əsərlər çap edilə bilməmişdir.

Vaqifin əsərləri 1908-ci ildə "Tazə həyat" qəzetinin müdiri Haşım bəy Vəzirov tərəfindən nəşr edilmişdir.

1925-ci ildə Səlman Mümtaz Vaqifin şeirlərindən bir hissə toplayaraq "Kommunist " qəzeti nəşriyyatında çap etdirmişdir. Yenə də şairin həmin müəllif tərəfindən toplanılan şeirləri 1937-ci ildə çap olunmuşdur. Vaqifin əsərlərinin elmi nəşri 1945-ci ildə Azərbaycan Elmlər Akademiyasının Nizami adına Dil və Ədəbiyyat Institutu tərəfindən nəşr olunmuşdur.

Bakıda Nizami muzeyi binasında Azərbaycanın görkəmli yazıçıları sırasında Vaqifə də heykəl qoyulmuş, böyük xalq şairi Səməd Vurğun Vaqifin şərəfinə bir sıra gözəl şeirlər yazmışdır. Səməd Vurğun öz şeirlərində Vaqifin əsərləri ilə tərbiyələndiyini də qeyd etmiş, ən yaxşı əsərlərindən hesab olunan "Vaqif " dramını da böyük şairin həyatına həsr etmişdir.

Vaqifin oxuculara təqdim olunan bu nəşri əlyazmaları əsasında tərtib edilmiş, 1937-ci ildə Azərnəşr tərəfindən Vaqifin çap edilmiş külliyyatı ilə müqayisə edilib dürüstləşdirilmişdir. Təqdim edilən həmin kitabda Vaqifin bu vaxta qədər nəşr olunmamış bir sıra şeirləri başqa əlifbalarla XIX əsrin əvvəllərində yazıya alınmış əlyazmalarından köçürülmüşdür. Eyni zamanda Qaracadağlı Əndəlibin Leninqrad Şərqşünaslıq Institutunun əlyazmaları şöbəsində saxlanılan əsərlərinin sonundakı əlavələrdən və Azərbaycan Elmlər Akademiyasında mövcud olan cünglərdən istifadə edilmişdir.

Beləliklə, bu elmi nəşrdə Vaqifin əsərlərinin mühüm bir hissəsi əhatə edilmişdir. Lakin bu heç də o demək deyildir ki, Vaqifin bütün əsərləri kitabda toplanmışdır. Çox ehtimal ki, xüsusi əllərdə olan və tədqiqatçılara çatmayan cüng və əlyazmalarında şairin çap edilməmiş əsərləri vardır.

***Həmid Araslı***

# QOŞMALAR

O şux qəmzələrin, xəncər kirpiyin
Gündə olur yüz min qan qabağında,
Xumar-xumar baxan ala gözlərin
Gərəkdir verəsən can qabağında.

Qaşın qabağında sığallı birçək,
Sayə salmış üzə şölə mübarək,
Amma iki dəstə tər bənövşə tək
Qoymuş al yanağın yan qabağında.

Zülfündən qoxuşar gülü reyhanlar,
Qurban hər muyinə yüz min cavanlar,
Pişvazına gəlir huri qılmanlar,
Məlayik durmuşlar san qabağında.

Vaqif qurban zənəxdanın çahinə,
Şirin gülüşünə, xoş nigahinə,
Qul olasan belə xublar şahinə,
Durasan hər axşam, dan qabağında.

Xublar arığından yarımaq olmaz,
igidin həmdəmi gərək çağ ola.
Bəstə boylu gərək, mina gərdənli,
Zülfi siyah, var əndamı ağ ola.

Səhər dura sürmə çəkə gözünə,
Birçəklərin həlqə qoya üzünə,
Cilvələnə, sığal verə özünə,
İşi, gücü gülüb-oynamaq ola.

Döşün açıb, əl dəyəndə yaxıya,
Ağ gülün bağrına peykan toxuya,
Bədənindən müşkü ənbər qoxuya,
Zülfü gərdənində bir qucaq ola.

Bir mayabud gərək, baldırı yoğun,
Sərasər ət basa dizin, topuğun,
Əl dəyəndə dura buğunbabuğun
Titrəyə, quyruqdan çox yumşaq ola.

Həyası üzündə, əqli başında,
Öldürə Vaqifi gözü qaşında,
Ya on üç, ya on dörd, on beş yaşında,
Nə ondan böyükrək, nə uşaq ola.

Bir sənəmin sinəsinə müştağam,
Çox çəkirəm ahü zarı, şamama!
Mən ha qaldım həsrət, əlim yetişməz,
Sən get, gör cananı barı, şamama.

Mətləbidir bir növrəstə – könlümün,
Olmadı dərmanı xəstə könlümün,
Onun üçün bu şikəstə könlümün
Nə səbri var, nə qərarı, şamama!

Yaxa açıb ta ki, sinə göstərdin,
Sərasər bağrımı qana döndərdin,
Mənim dərdimdəndir sənin də dərdin,
Rəngindir nə yavuz sarı, şamama!

Mənim yarım bir əcaib dilbərdir,
Üzü təzə güldür, zülfü ənbərdir,
Sanasan ki, iki qəndü şəkərdir
Qoynundakı qoşa narı, şamama!

Qurbanam Vaqifin bu xaməsinə
Ki, yazar dərdini dost naməsinə,
Yetə bilməz yarın şamaməsinə,
Olsa bu dünyanın varı şamama!

Can verib yüz minnət ilə almışam,
Göndərirəm səni yarə, şamama!
Tazə tağdan üzülübsən, oxşarsan
Yarın qoynundakı narə, şamama.

Cismin nə nazikdir, gül bədən kimi,
Bir xoş qoxun gəlir, yasəmən kimi,
Nədən saralıbsan sən də mən kimi,
Nədir dərdin, ey biçarə şamama?

Haqdır, səndə vardır xeyli nəzakət,
Yarın şamaması bir qeyri babət;
Qorxuram çəkəsən külli xəcalət
Dursan onla bərabərə, şamama.

Yarın şamaməsi oxşar şəkərə,
Heyran olur mələk, əgər göstərə,
Yaraşıqdır ağ sinəsi mərmərə,
Qılıb çox ciyərlər parə, şamama.

Giribandan nagah olandı aşkar,
Dağılır ağılın, huşum – hər nə var,
Xəstə Vaqif tifil kimi qan ağlar,
Neçun qılmazsan bir çarə, şamama?

Bənəfşə tək ənbər zülfün buy verir,
Hər yuyub sərəndə həvayə, Zeynəb!
Onun ətrin dimağımdan üzməsin,
Əmanət et badi-səbayə, Zeynəb!

Qaşa vəsmə, gözə sürmə çəkəndə,
Siyah zülfü dal gərdənə tökəndə,
Sallanıban kəklik kimi səkəndə,
Oxşarsan yaşılbaş sonayə, Zeynəb!

Səni sevən çox bəlayə tuş olur,
Əql gedir başdan, fəramuş olur,
Avazın gələndə can bihuş olur,
Qurbanam o nazik sədayə, Zeynəb!

Yanağı laləsən, qaməti dalsan,
Ağzı şəkər, dili, dodağı balsan,
Sanasan ki, yorğun, vəhşi maralsan,
Olubsan yaraşıq obayə, Zeynəb!

Sənsən padışahı, xanı Vaqifin,
Əqli, huşu, din-imanı Vaqifin,
Həsrətindən çıxdı canı Vaqifin,
Nolur ki, gələsən burayə, Zeynəb!

Gəl, ey qələbəyi Məhəmmədxan bəy,
Əgər səyyad isən, bərəni saxla!
Nağaraxananın yolların gözlə,
Boşşalıdan gələn dərəni saxla!

Evlərdə məst, başmaq satanı qoyma,
Çaxır içib sərxoş yatanı qoyma,
Özünə qardaşlıq tutanı qoyma,
Qonaq üçün çörək verəni saxla!

Dost dostun yolunda düşər ziyana,
İgid gərək tab gətirə dayana,
Nağaraxanadan bir az bu yana,
Zalım, [sən] cəhd eylə oranı saxla!

Sən mənim sözümə heç gətirmə şək,
Bizim evlərdə də gəl görün tək-tək,
Dirrik-tərəvəzə yaxşı keşik çək,
Kişniş, şüyüt, təzə tərəni saxla!

Ağqız oğlu Piri, sən məni əkmə,
Özgənin yurdunda o damı tikmə,
Qeyri gözəllərdən heç fikir çəkmə,
Sən elə o gözü çərəni saxla!

Xeyli vaxtdır ayrılmışıq yar ilən,
Gördük, amma tanışmadıq, ayrıldıq,
Qaldı canda gizli-gizli dərdimiz,
Bircə kəlmə danışmadıq, ayrıldıq!

Qərib-qərib durduq biganələr tək,
Soyuq-soyuq baxdıq divanələr tək.
Dönmədik başına pərvanələr tək,
Eşq oduna yanışmadıq, ayrıldıq!

Yarım saat bir arada qalmadıq,
Eşq atəşin canımıza salmadıq.
Yalvarıban yarın könlün almadıq,
Elə getdi, barışmadıq, ayrıldıq!

O zaman ki, aşnalığı tərk etdik,
Cüda düşdük, xeyli ciyər bərkitdik,
Aralıqdan könül quşun ürkütdük,
Bir-birilə qonuşmadıq ayrıldıq!

Vaqif sevdi bir iqrarsız bivəfa,
Bada getdi tamam çəkdiyi cəfa,
Görüşübən eyləmədik xoş səfa,
Qucaqlaşıb, sarışmadıq ayrıldıq!

Olmayaydı belə səfərə çıxmaq,
Biz yar ilə danışmadıq, ayrıldıq.
Halallaşıb, hümmətləşib dost ilən,
Təmənnəşib görüşmədik, ayrıldıq.

Bilməm, kimə deyim dərdim neçəsi,
Yarın tər məməsi, sinə haçası.
Yuxu məni aldı gələn gecəsi,
Gül üzündən öpüşmədik, ayrıldıq.

Biz doymadıq yarın şirin dilindən,
Şəkər parçasından, ləbi-balından,
Mina gərdənindən, incə belindən,
Hayıf oldu, sarışmadıq, ayrıldıq.

Vaqifəm, üstümə gəlməz xas əli,
Silinmədi heç könlümün pas əli.
Nə müddətdir, canan bizdən küsəli,
Könlün alıb barışmadıq, ayrıldıq.

Bir cavan tazədən gəlib ərsəyə,
Əcayib oğlandır, adı Məhəmməd.
Zahirin özü tək pak imiş əsli,
Ola bilməz heç evladi-Məhəmməd.

Yeni gəlib xətti, tər bənövşə tək,
Qaşı, gözü elə baxdıqca göyçək,
Danəndə, fəhmidə, qabilü zirək,
Sahibcamal, söz ustadı Məhəmməd.

Sərxoş oturanda əlində sazı,
Bənd edir quşları göydə avazı,
Yeni yetən igidlərin şahbazı,
Sanasan ki, bir sonadı Məhəmməd.

Qələmdə, qılıncda, sazda, sədadə
Bərabəri yoxdur dari-fənadə,
Mehrü məhəbbəti həddən ziyadə,
Göstərir çox etiqadı Məhəmməd.

Məşhər hekayəti müşkül hekayət,
Ya həzrəti-rəsul, eylə inayət,
Vaqifəm – qulami-şahi-vilayət,
Eylə mənə bir imdadı, Məhəmməd.

Duruban eşqilə güzar eylədim,
Bir pərinin oldum mehman evində.
Zərrəcə görmədim hörmət, izzətin,
Qaldım elə, peşman-peşman evində.

Ta ki, məni gördü ol qəlbi qara,
Çəkdi yaşmağını o gül rüxsara,
Döndərdi üzünü, tutdu divara,
Sanasan ki, yoxdur insan evində.

Dodağı şəkərdir, göftarı şərbət,
Nə fayda, eyləməz şirin məhəbbət.
Məxləsi ki, yoxdur onda bir ləzzət,
Boldur elə acı qəlyan evində.

Keçmə o dilbərin sən otağından,
Tər bənəfşə qoxar hər bucağından,
Sanki bir guşədir cənnət bağından,
Açılıbdır güli-əlvan evində.

Vaqif, bir kimsə ki, bizdən yaşına,
Yəqin bil ki, bizlən olmaz aşina,
Gəldiyimiz heç gəlmədi xoşuna,
Tapdım mən halını ürfan evində.

Siyahtel görmədim Kür qırağında,
Məgər heç yaşılbaş olmaz bu yerdə?
Tərlan könlüm yenə uca dağlara
Havalanıb, hərgiz qonmaz bu yerdə.

Bu diyarda kəlağay yox, katan yox,
Sinəm buta, müjgan oxun atan yox,
Sərxoş durub bir nəzakət satan yox,
Heç sövdagar fayda bulmaz bu yerdə.

Bəzək bilməz bu diyarın göyçəyi,
Tanımaz al çarqat, zərrin ləçəyi,
Ağ buxaq altından həlqə birçəyi
Tər məmə üstündən salmaz bu yerdə.

Yarın xəyalilə bu gün mən şadəm,
Qəribliyə düşsəm, qan ağlar didəm.
Pərisi yanında olmayan adəm
Nə yaxşı sağ qalır, ölməz bu yerdə.

Desələr ki, Vaqif, nə oldu sənə,
Rəngi-ruyin dönüb heyvaya genə,
Əli tər məmədən üzən kimsənə
Saralıban necə solmaz bu yerdə.

Bu gün bir əcayib gözəl sevmişəm,
Beləsi olammaz heç vilayətdə,
Sanasan ki, camalından nur yağır,
Yaranıbdır, yarəb, nə xoş saətdə.

Al çarqatdan yaşmaq tutub çənəyə,
Simin yaraşdırıb zər nimtənəyə,
Deyildir bərabər heç kimsənəyə,
Xubların şahıdır şanü şövkətdə.

Gülabilən zülfün cığasın əyər,
Üzünə baxanda qan olur ciyər,
Göydən yerə enmiş mələkdir məgər,
Yoxsa insan olmaz belə surətdə.

Biləyi, bazusu, hər bəndi gözəl,
Gərdəndə zülfünün kəməndi gözəl,
Ayna tutdu, durdu bəzəndi, gözəl,
Sallandı, görəsən, nə qiyamətdə.

Sona cığası tək sərində teli,
Ağ gül yarpağı tək ayağı, əli,
Cismi dolu, nazik bədəni, beli,
Görməmişəm dilbər bu nəzakətdə.

Ayıraydın obasından, elindən,
Bir xəlvətdə tuta idin əlindən,
Əməydin ağzından, şirin ləbindən,
Görəydin necədir dadda, ləzzətdə.

Növcavanlar qoy həmişə var olsun,
Amma ki, bizlərdən xəbərdar olsun.
Vaqifin duası sənə yar olsun!
Səni haqq saxlasın ömrü dövlətdə.

Bir xəlvət yer ola, əğyar olmaya,
Onda söhbət edək ikimiz belə.
Əl-ələ tutuşub deyək, gülüşək,
Tutaq bir xoş ülfət ikimiz belə.

Qol-boyun oturaq, sürtək üz-üzə,
Baxaq bir-birmizə göz süzə-süzə.
Gah-gah qucaqlaşıb köyüs-köyüsə
Görək ləbdən ləzzət ikimiz belə.

Sürmələnsin ala gözlər şux olsun,
Siyah kirpik ucu almaz ox olsun,
Səg rəqiblər aralıqdan yox olsun,
Gəzək bir fərağət ikimiz belə.

Doyunca zövq alaq nazü qəmzədən,
Əndişə çəkməyək heç bir kimsədən,
Hər gecələr, şirin-şirin, sübhətən
Eyləyək hekayət ikimiz belə.

Vaqif, yardan eşit gələn cavabı,
Açaq üzdən, gözdən tamam niqabı,
Gəh-gəh içib sərxoş olaq şərabı,
Gündə sürək vəhdət ikimiz belə.

Ağla gözüm, ayrılırsan canandan,
Hər kəsi ki, görsən, şikayət eylə!
Öldün getdin, bəlkə yarı görmədin,
Kəbəyi-kuyini ziyarət eylə!

Sən mənim cananım, ruhi-rəvanım,
Ləbləri şirinim, qönçə dəhanım,
Bir saat görməsəm, tuti zəbanım,
Qopacaq başıma qiyamət eylə!

Vaqif bir şeydadır, dolanır bağı,
Xəstədir, dərmanı – dilbər dodağı.
O alma yanağı, büllur buxağı,
Allah, bədnəzərdən səlamət eylə!

Ey süsən sünbülüm, al zənəxdanlım,
Qurban olsun lalə, gül ilən sənə.
Bu neçə gündür ki, səndən ayrıyam,
Sanasan həsrətəm il ilən sənə!

Deməli çox gizlin dərdi-dilim var,
Qorxuram ki, deyim, eşidə əğyar,
İstərəm ki, yazam göndərəm, ey yar,
Səhər oğrun əsən yel ilən sənə!

Ağzı piyaləsən, gərdəni mina,
Nazik əllərində innabı həna,
Səni görən deyər, yaşılbaş sona,
Ucu həlqə, siyəh tel ilən sənə!

Çoxlar sənə iyma ilən baş əyər,
Mum tək ərir, olsa bağrı daş əyər,
Tuba görsə, ikram eylər, baş əyər,
Bu gözəl boy ilən, bel ilən sənə!

Yadıma düşəndə zülfün ənbəri,
Qüllab girər ciyərimdən içəri,
Mən şaham, ey gözəllərin sərvəri,
Qurbanam Vaqif tək qul ilən sənə!

Sərv boylum, bir çıx, görüm boyunu,
Onda qurban edim canı mən sənə.
Qaşlarının tağı qibləgahımdır,
Fəda qılım din-imanı mən sənə.

Adam gərək görsün həqqi arada,
Hanı sənin kimi bir pərizada,
Mələkdən də səni billəm ziyada,
Tay etmənəm heç insanı mən sənə.

Baxmaq ilən doymaq olmaz üzündən,
Danışanda şirin-şirin sözündən,
Onun üçün göz kəsmərəm gözündən
Müştağam, ey şəkər kanı, mən sənə.

Qaşa, gözə sürmə nə gözəl çəkdin,
Cilvələnib zülfə həm seyqəl çəkdin,
Sən nə üçün axır məndən əl çəkdin?
Eyləməzdim bu gümanı mən sənə.

Gözəl sən tək belə şuxü şən gərək,
Həmdəmi də həm özünə tən gərək,
Sənə Vaqif kimi dərd bilən gərək,
Layiq görməm hər nadanı mən sənə.

Sənsən, ey nazənin, gözəllər şahı,
Ola bilməz kimsə bərabər sənə.
Sərxoş durub sallananda hər yana,
Mat qalır, ey sərv, sənubər sənə.

Baxdıqca baxışın şirin, gözün şux,
Bir əcəb cavansan nəzakətin çox,
Kamalında, camalında eyib yox,
Pərvərdigar vermiş hər hünər sənə.

Söz yox zənəxdana, zülfə, yanağa,
Qamətə, gərdənə, qaşa, qabağa,
Bir şirin dilbərsən başdan ayağa,
Nə nabat bənzəyir, nə şəkər sənə.

Ya bədrlənmiş bir mahi-tabansan,
Ya cənnət bağında güli-xəndansan,
Ya mələksən, ya da huri qılmansan
Ey sevdiyim, insan kim deyər sənə?

Çoxlar getdi iltimasa, gəlmədin,
Üzüm üstə qədəm basa gəlmədin,
Vaqif öldü, neçün yasa gəlmədin?
Ya zahir olmadı bu xəbər sənə?

Doldu dimağıma zülfün ənbəri,
Valeh oldu könül həvadən sənə.
Əlim yetməz – namə yazıb dərdimi
Göndərirəm badi-səbadən sənə.

Oturuşun gözəl, duruşun gözəl,
Sallanışın gözəl, yerişin gözəl,
Xoyun, xülqün gözəl, hər işin gözəl,
Bəxş olub bu xubluq xudadən sənə.

Dodaqların oxşar ləli-Yəmənə,
Yada düşdü, bağrım qan oldu yenə,
Siyah tel düzürsən bəyaz gərdənə,
Düşübdür bu qayda sonadən sənə.

Fikrü xəyalındır könlüm ziynəti,
Şirin sözlərindir ağzım ləzzəti,
Sənsən mənim ömrüm, günüm vəhdəti,
Yetişməsin, ya rəb, bəladən sənə.

Qəm evində saldın küncə Vaqifi,
Eylədin muyindən incə Vaqifi,
Neçün incidirsən munca Vaqifi,
Nə hasil bu cövrü cəfadən sənə?

Sığallanıb-sığallanıb siyah zülf,
Nə gözəl düşübdür üzə, Fatimə!
Can alırsan yenə, bu nə sürmədir
Çəkibsən ol xumar gözə, Fatimə!

Mən mayiləm sənin zənəxdanına,
Həlqə-həlqə zülfi-pərişanına,
Cəvahirlər xərc eylərəm şanına,
Əgər müştaq olsan sözə, Fatimə!

Can mülkünə verməm saçının dəngin,
At canıma kirpiklərin xədəngin,
Ta ki, gördüm yanağının mən rəngin,
Düşmüşəm bir oda, közə, Fatimə!

Yay kimi nə gözəl çəkibsən qaşı,
Ona söz yox, hər nə desəm yaraşı,
Sənə peşkəş etmənəmmi can-başı;
Neçün bir gəlməzsən bizə, Fatimə?

Eşqin atəşidir məni əridən,
Can üzüldü baxa-baxa geridən,
Dönmüşəm mələkdən, tamam pəridən,
Vaqifəm, sevmişəm təzə Fatimə!

Saçın zəncirinə könül bağladım,
Məcnun kimi düşdüm dağa, Fatimə!
Neçün məni görcək sərxoş ötürsən,
Bir baxmazsan sola-sağa, Fatimə!

Özün pəri, xülqü xoyun fəriştə,
Harda olsan ora dönər behiştə,
Sən gərəkdir gündə çıxasan gəştə,
Gül düzəsən gül buxağa, Fatimə!

Haçanacan canım odlara yaxım,
Hər tərəfə daşqın sellər tək axım.
Çox müştaqəm aç üzünü, qoy baxım
Ənbər zülfə, gül yanağa, Fatimə!

Layiq deyil sənə nakəsü biqəm,
Adam gərək ola adama həmdəm.
Canım çıxar səni görməsəm bir dəm,
Getmə məndən sən uzağa, Fatimə!

Vaqif səni sevdi xublar içində,
Bir təzə qönçəsən gülzar içində,
Söz danışmaq olmaz əğyar içində,
Gəl çəkilək bir qırağa, Fatimə!

Bir üzü gül, rəngi lalə, zülfü tər,
Gəştə çıxıb, dərər taza bənəfşə.
Dəstə-dəstə sancıb buxaq yanına,
Yaraşıbdır o şahbaza bənəfşə.

Cismi mərmər, həlqə zülfləri qara,
Onu görən məcnun olur – avara,
Hörüb saçlarını, salıb qatara,
Düzüb telə, həm qotaza bənəfşə.

Yaşı on səkkizə yenicə yetmiş,
Gözəllikdə tamam xəlqi mat etmiş,
Gəştə çıxmış – yar gəldiyin eşitmiş,
Dağa salıb bir avaza bənəfşə.

Göysün açıb, ağ qolların çırmasın,
Elə gəzsin, onu rəqib görməsin,
Əğyar ilən çıxıb seyrə, dərməsin,
Layiq olmaz anlamaza bənəfşə.

Sən sallanıb qabağımdan gedəndə,
Hərgiz qalmaz səbrü ixtiyar məndə.
Vaqif zülflərini tərif edəndə,
Gərəkdir ki, əvvəl yaza: bənəfşə.

Bir gözəl ki, şirin ola binadan,
Yüz il getsə onun dadı əksilməz.
Təzəliyi, köhnəliyi bir olur,
Gövhər tək qiymətdə adı əksilməz.

Gözəllikdən düşməz heç əsilzada,
Günbəgün qaməti dönər şümşada,
Mehrü məhəbbəti olur ziyada,
Etibarı, etiqadı əksilməz.

Nə qədər ki, yüzə yetirsə yaşı,
Ta ki, həkdən düşə, titrəyə başı,
Genə can almağa gözilə qaşı,
Qəmzəsinin heç cəlladı əksilməz.

Cövhəri pak olur təzə cavandan,
Hərgiz əl götürməz şövkətü şandan,
Müjgan xədənglərin keçirir candan,
Peykanının heç poladı əksilməz.

Vaqif, istər isən görəsən ləzzət,
Gəl sev bir dərd bilən, əhli-məhəbbət.
Növcavanlar sevən heç olmaz rahət,
Gecə-gündüz heç fəryadı əksilməz.

Sərasər bir yerə yığılsa xublar,
Sənin bir muyinə tay ola bilməz.
Günəş təki şölə verər camalın,
Belə gözəllikdə ay ola bilməz.

Heç gözəli sən tək şux görməmişəm,
Nə fayda, hüsnünü çox görməmişəm.
Uzun kirpiyin tək ox görməmişəm,
Qaşların tərzində yay ola bilməz.

Həsrətindən bağrım qan ilən dolub,
Heyva təki rəngim saralıb-solub,
Bu xubluq ki, həqdən bəxş olub,
Heç kimsəyə belə pay ola bilməz.

Qəddin şahbaz, ağ bədənin səmən tək.
Yanağın lalədən ziyada göyçək.
Ustad səni çəkib manəndi-mələk,
Bundan artıq həqqü say ola bilməz.

Vaqifəm, mən sənə heyran olmuşam,
Qaşların yayına qurban olmuşam,
Dərdindən didəsi giryan olmuşam,
Qanlı yaşım kimi çay ola bilməz.

Dəhanın sədəfdir, dişlərin inci,
Sanasan ağızın püstədir, ay qız!
Xumar gözlərini sevəndən bəri,
Dərdə düşüb canım xəstədir, ay qız!

Sərasər əndamın təzə qar kimi,
Zülfün gərdənində şahimar kimi,
Rəngi bəyaz, özü xırda nar kimi,
Qoynundakı əcəb nəstədir, ay qız!

Niqab çəkib məndən yaşınma, zalım,
Pərişan olubdur mənim əhvalım,
Əqlü huşum mənim, fikrü xəyalım
Şux gözdə, qəmzədə bəstədir, ay qız!

Cəmalın günəşdir, qəmərdir üzün,
Şəkərdir dəhanın, şirindir sözün,
Yağıdır müjganın, cadudur gözün,
Cəllad kimi qəmzən qəsdədir, ay qız!

Vaqifəm, mən Məcnun, sən mənim Leylim,
Baxdıqca, gözümdən tökürəm seylim,
Mən sənə mailəm, səndədir meylim,
Demə, səndən qeyri kəsdədir, ay qız!

Çoxdan bəri yarın fərağindəyəm,
Nə olaydı bir buraya gələydi,
Çəkəydi könlümü künci-zülmətdən,
Döndərəydi üzün ayə, gələydi.

Görməyə-görməyə gülüzarımı,
Bülbül tək artırdım ahü zarımı.
Təbibim oluban bu azarımı
Yetirəydi bir dəvayə, gələydi.

Gedibən kuyində qıllam şivəni,
Yığaram başıma dostu, düşməni,
O ha billəm gəlməz görməyə məni,
Barı, gendən tamaşayə gələydi.

Ünümdən titrədi tamam vilayət,
Elə sandılar ki, qopdu qiyamət,
Nə qayım durubdur ol sərvi-qamət,
Tərpənəydi, bir lərzayə gələydi.

Cəm olsa yanımda tamam sənəmlər,
Dağılmaz könlümdən fikrü ələmlər
Ayağa salıbdır Vaqifi qəmlər,
Baş çəkəydi binəvayə gələydi.

Bədənini gül yaradan ilahi,
Sərasər ətrini ənbər eylədi,
Gözəllikdə kimdir sənə tay ola,
Hüsnün mələkləri çakər eylədi.

Surətini çəkdi ol gün ki, nəqqaş,
Camalını qıldı hər gözəldən baş.
Cəbininə qoydu bir müqəvvəs qaş,
Siyah kirpiyini xəncər eylədi.

Zülfünü bənzətdi müşkin kəməndə,
Ucun həlqə qoydu sibi-zəğəndə,
Ləbiyin ləzzətin bənzətdi qəndə,
Dəhanını şəndü şəkkər eylədi.

Səni xəlq eylədi gül dəstəsi tək,
Pəridən əlasan, mələkdən göyçək,
Cismindir münəvvər ağü nazikrək,
Ol səmən sinəni mərmər eylədi.

Ey gözəllər şahı, kərəm et mana,
Baxmagilən hərgiz əğyardan yana,
Şükr olsun Allaha – Vaqifi sana
Qapında qulami-kəmtər eylədi.

Badi-səba, bir xəbər ver könlümə,
Ol güli-xəndanım neçün gəlmədi?
Xəyalım şəhrini qoydu viranə,
Sərvərim, sultanım neçün gəlmədi?

Sərxoş yerişinə qurban olduğum,
Görməyəndə dəli-devran olduğum.
Mina gərdəninə heyran olduğum,
Sərvi-xuramanım neçün gəlmədi?

Qaşı kaman, kirpikləri qəməlim,
Ağzı şəkkər, dodaqları yeməlim,
Əlvan kəlağaylı, bəyaz məməlim,
Sinəsi meydanım neçün gəlmədi?

Mehrabü mənbərim, Kəbeyi-ülyam,
Əqlim, huşum, canım, həm dinim, dünyam,
Elim, günüm, obam, Misrü Züleyxam,
Yusifi-Kənanım neçün gəlmədi?

Nəsrin binaguşlum, bənəfşə muylum,
Pərilər tələtlim, məlaik xoylum,
Büllur lətafətlim, sənubər boylum,
Huriyü qılmanım neçün gəlmədi?

Ağzı xeyir sözlüm, dili diləklim,
Tər qollum, ağ əllim, gümüş biləklim,
Qarıçqay cilvəlim, tavus bəzəklim,
Libası əlvanım neçün gəlmədi?

Vaqif, ilə döndü bir saətimiz,
Nə səbrimiz qaldı, nə taqətimiz.
Bu gündən belədir qiyamətimiz;
Gəlmədi cananım, neçün gəlmədi?

Siyah telli bir sənəmin ucundan
Badə getdi din-imanlar, əfəndi!
Ol oda ki, mən düşmüşəm yanıram,
Düşməsin heç müsəlmanlar, əfəndi!

Könül deyil sən gördüyün havada,
Dərdim olur gündən-günə ziyada,
Hər zaman düşəndə ləbləri yada,
Tökülür gözümdən qanlar, əfəndi!

Bilməm nə nəhs gündə çıxdım bu dağa,
Bir lalə üzündən düşdüm irağa,
Yana-yana qaldım belə fərağa,
Bərbad olsun ol zamanlar, əfəndi!

Mənim meylim yoxdur sultandan, xandan,
Yarımın arzusun saxlaram candan.
Xalq da bilir, mənim könlümdür ondan
Olsa yüz min növcavanlar, əfəndi!

Molla odur hər nə görsə kitabda,
Onu şərh eyləyə haqda-hesabda,
Vaqif deyir sənə, mənə bu babda,
Hələ azdır bu divanlar, əfəndi!

Boyun surahıdır, bədənin büllur,
Gərdənin çəkilmiş minadan, Pəri!
Sən ha bir sonasan, cüda düşübsən
Bir bölük yaşılbaş sonadan, Pəri!

İxtilatın şirin, sözün məzəli,
Şəkər gülüşündən canlar təzəli,
Ellər yaraşığı, ölkə gözəli,
Nə gözəl doğubsan anadan, Pəri!

Üz yanında tökülübdür tel nazik,
Sinə meydan, zülf pərişan, bel nazik,
Ağız nazik, dodaq nazik, dil nazik,
Ağ əllərin əlvan hənadan, Pəri!

Avçısı olmuşam sən tək maralın,
Xəyalımdan çıxmaz hərgiz xəyalın.
Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan, Pəri!

Günəş təki hər çıxanda səhərdən
Alırsan Vaqifin əqlini sərdən.
Duaçınam, salma məni nəzərdən,
Əksik olmayasan sənadan, Pəri!

Cəmalın gözümdən nihan olalı,
İstərəm baxmayım dünyayə, Pəri!
Xəyal eylədikcə o sərv qəddin,
Dönər qanlı yaşım dəryayə, Pəri!

Olsalar yüz mələk, yüz huri qılman,
Yüz mina gərdənli, zülfü pərişan,
Yüz lalə yanaqlı, ləbləri mərcan,
Könül dönməz səndən kimsəyə, Pəri!

Sən gedəli, mən ziyadə ağlaram,
Vermişəm ömrümü bada, ağlaram,
Hər düşəndə qəddin yada, ağlaram,
Ünüm çıxar ərşi-əlayə, Pəri!

Səndən ayrı bağrım kababa dönmüş,
Yıxılmış dil şəhri xəraba dönmüş,
Firqətin damu tək əzaba dönmüş,
Didarın cənnətül-məvayə, Pəri!

Bir görəydim sənin gül cəmalını,
Cadu gözlərini, yay hilalını,
Müənbər saçını, hindu xalını,
Yetərdi hər dərdim dəvayə, Pəri!

Peyvəstə qurulsun qaşın kamanı,
Oxların sinəmdən keçsin nihanı,
Gül bədənin heç görməsin yamanı,
Lütf eylə Vaqifi-şeydayə, Pəri!

Ey huri liqalım, mələk simalım,
Gözəllikdə olmaz kimsə sən kimi!
Al yanağın həlqə-həlqə yanında
Bənəfşə zülflərin – yasəmən kimi.

Gərdənində tellər nə gözəl teldi,
Onların məskəni o nazik beldi,
Nə səngi-mərmərdi, nə bərgi-güldi,
Bu ağ əndam kimi, bu bədən kimi.

Qamətin tək heç bir qamət biçilməz
Dodaqların tər qönçədən seçilməz,
Bülbül cəh-cəh vurub güllər açılmaz,
Belə şirin-şirin sən gülən kimi.

Nə xoş sitəmkarsan zalimü xunxar,
Onun üçün səndən çox gileyim var,
Bilmənəm ki, sənə nə demiş əğyar,
Xəyalındır məndən genə gen kimi.

Vaqifi möhnətü fərağa salma,
Əğyarın sözünü qulağa salma,
Məni öz dərindən qırağa salma,
Heç aşiq tapılmaz sənə mən kimi.

Badi-səba, bir xəbər ver könlümə,
Görüm o yanağı lalə gəlirmi?
Həsrətindən könül dönübdür qana,
Baş çəkməyə bizim halə gəlirmi?

Sallananda eylər nazü qəmzələr,
Üz döşər payinə görən kimsələr,
Qaşa-gözə çəkmiş siyah sürmələr,
Sığal verib xətti xalə, gəlirmi?

Allah muradını versin o yarın,
Rəqibi kuyindən sürsün o yarın,
Mübarək guşuna, görsün o yarın,
Mən çəkdiyim ahü nalə gəlirmi?

Ox kirpiyin ucu a yaşa dönmüş,
Gözlərin cəlladı tamaşa dönmüş,
Səg rəqibin canı nə daşa dönmüş,
Bir zəvalə gör həvalə gəlirmi?

Vaqifəm, yarıdım dosta, düşmənə,
Ta ki, cünun oldum yetişdim sənə.
Sənin təki gözəl sevən kimsənə
Dəxi əqlə, bir kəmalə gəlirmi?

Bu necə zülmdür mənə eylərsən,
Adam məgər bir insafa gəlməzmi?
Bir gün görərsən ki, vallah, ölmüşəm
Bu qədər dərd çəkən axır ölməzmi?

Xubların bəzisi necə zad olur,
Yarın qəmgin qoyar, özü şad olur.
Bir sevgi ki, sevgisindən yad olur,
Məgər onun yaxşılığın bilməzmi?

Xublarda adətdir, nəzakət satar,
Genə xəyalını xəyala qatar,
Gözəl olan məgər başın dik tutar
Aşiqinə doğru heç əyilməzmi?

Eşq oduna yandı canım sərbəsər,
Allaha bax, ey zalimü sitəmkər,
Aşiqinə qanlar ağladan dilbər
Rəhmə gəlib göz yaşını silməzmi?

Bir pəri olaydı bu dəmdən ötrü,
Özün öldürəydi adəmdən ötrü,
Qədr bilən yaxşı həmdəmdən ötrü
Vaqif, can üzülür, bəs üzülməzmi?

Nədən küsüb təbi nazik olan yar,
Bilmənəm ki, buna nə çarə gərək?
Nə deməkdir dost – dostundan əyilmək,
Gərəkdir düzələ yol, ara gərək.

Görəsən, nə demiş rəqibi-bipir,
Yar olubdur məndən habelə dilgir,
Mən ondan etmərəm canımı təqsir,
Amma ki, özündən işarə gərək.

Ətəkliyi altun, qəsabəsi zər,
Çəhrayı çarqatı qəddə bərabər,
Başında bərq vurur gün kimi zivər,
Onu görən düşə odlara gərək.

Əşrəfindən üzlük üzündə göyçək,
Boğazı altında sığallı birçək,
Qabaq belə bəyaz, yanaq lalə tək,
Göz ala gərəkdir, qaş qara gərək.

Oxuyub Vaqifin həm əzzəlindən,
Şirin qafyəsindən şux qəzəlindən,
Durub öpüb ayağından, əlindən,
Barışmaq yalvara-yalvara gərək.

Açıqbaşda əgər olsa bir dilbər,
Onda bu nişanlar müəyyən gərək.
Əndamı ayinə, qəddi mötədil,
Siyah zülfü qamətinə tən gərək.

Yanağı laleyi-bahari kimi,
Ləbləri yaqutun kənari kimi,
Bir danə nasüftə mirvari kimi,
Başdan ayağadək ağbədən gərək.

Təmizlikdə ola meylü həvəsi,
Olmaya aşiqə nazü qəmzəsi,
Gül təki qoxuya nitqü nəfəsi,
Zülfü ya bənəfşə, ya səmən gərək.

Əl-ayağı qaidədə, disturda,
Saqi fərbeh, topuqları çuxurda,
Bir qat ət içində, sümüyü xırda,
Ağzı-burnu nazik, üzü gen gərək.

Növrəsidə, on dörd, on beş yaşında
Eyb olmaya kirpiyində, qaşında,
Həyası üzündə, əqli başında,
Qulluqda, söhbətdə müstəhsən gərək.

Tovus kimi cilvələnə hər səhər,
Bəzək verə camalına sərbəsər,
Dindirməmiş verə könüldən xəbər,
İşarə anlayıb hal bilən gərək.

Yaşadıqca cavanlana, enlənə,
Bir hicabda, bir pərdədə əylənə,
Nitqü nəfəsindən canlar dinlənə,
Şirin danışıban xoş gülən gərək.

Qövli sadiq ola, hər feli həlal,
Bilməyə kim, fitnə nədir, məkrü al,
Şam kimi qabaqda dura nitqi lal,
Kəsilsə də başı, dinməyən gərək.

Vaqif, yaxşı canan gərək can üçün,
Nədir çox çalışmaq bu cahan üçün,
Bir gözəl lazımdır bizim xan üçün,
Vali qulluğunda ərz edən gərək.

Bulud zülflü, ay qabaqlı gözəlin,
Duruban başına dolanmaq gərək.
Bir evdə ki, belə gözəl olmaya,
O ev bərbad olub talanmaq gərək.

Əndamı ağ gərək, sinəsi mərmər,
Siyah zülfü qamətinə bərabər,
Qoynu içi guya müşklə ənbər,
Basdığı torpağı yalanmaq gərək.

Sərxoş durub sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Gözə sürmə, qaşa vəsmə yaxanda,
Canım eşq oduna qalanmaq gərək.

Çıxa sarayından canlar alan tək,
Xişmə gələ gəh-gəh qəhri olan tək,
Şahmar zülfü dal gərdəndə ilan tək,
Hərdəm tərpənəndə bulanmaq gərək.

Vaqif, sənin işin müdam ah olsun,
Səg rəqibin ömrü qou kütah olsun.
Həmdəmsiz kimsənə əgər şah olsun,
Gədadır o kimsə dilanmaq gərək.

Getdim ala gözlü yarla danışam,
Dedi oğlan, dur get, söz vaxtı deyil.
Arif çoxdur, etmək olmaz işarət,
Oynatma qaşını, göz vaxtı deyil.

Cadu qəmzələrin mənlən yağıdır,
Bad əsir, zülfünü üzdən dağıdır,
Bundan sonra öpüb, qucmaq çağıdır,
İxtilat keçibdir, söz vaxtı deyil.

Vaqif deyir, yalvar yara, könlün al,
Bir busə diləyib, boynuna qol sal,
Ara xəlvət ikən, etmə qilü qal,
Tez ol, çıxdı canım, naz vaxtı deyil.

Bivəfasan, səndən üz döndərmişəm,
Yalançıya, biiqrara baxmaram.
Səni ox kirpiyə həsrət qoyaram,
Bağrın olsa para-para, baxmaram.

Harda görsən bir sevgili kimsənə,
İstər ki, xəyalın tez ona dönə.
Mənim yarım gərək baxa bir mənə;
Qeyri üzə baxan yara baxmaram.

Niqab çəkib üzə, xalı gizlərəm,
Siyah zülfü, rəngi-alı gizlərəm,
Qönçə təki gülcamalı gizlərəm,
Sallam səni ahü zara baxmaram.

Yanımda etibar sata bilməzsən,
Boynundan günahın ata bilməzsən,
Bizimlə ixtilat qata bilməzsən,
Danışma ki, o göftara baxmaram.

Vaqifi derlərdi çox gözəlsevən,
Elə bildim sən də onun kimisən,
Bildim indi, vallah, səndəkini mən:
Bivəfasan, biiqrara baxmaram.

Mən yenə xubların padişahından
Özümə dost bir nigarı tutmuşam.
Səyyad olub qurub məhəbbət torun,
Laçın gözlü xub şikarı tutmuşam.

Dal gərdəndən düşüb tutub dalı zülf,
Xoş göstərir zənəxdanı, xalı zülf,
Görməmişəm belə bir səfalı zülf,
Çox sünbüli-ənbərbarı tutmuşam.

Ağ üzündə siyah saçı bürməyi,
Dal gərdəndən düşüb baş endirməyi,
Miyanında saçın ucun hörməyi,
Bütün dünyada bu yarı tutmuşam.

Vaqifəm, görmüşəm bir türfə didar,
Çəkərəm görməyə bir də intizar,
Hər kəsin dünyada bir qibləsi var,
Mən də yönüm sənin sarı tutmuşam.

*
* *

Harda görsəm bir şux, kaman qaşlını,
İstərəm canımı qurban eyləyəm.
Tutam zülfün ucun, dönəm başına,
Bağrımı oduna büryan eyləyəm.

Mən bilirəm qədrin sərxoş cavanın,
Həlqə-həlqə zülfün, tər zənəxdanın,
Bu gül əndamlının, sərvi-rəvanın
Duram yerişinə seyran eyləyəm.

Mən onun dərdinə oldum mübtəla,
Şəmi-xiyalıma o verir ziya,
Xublardan ki, mənə gəlsə hər bəla,
İstəməm ona mən dərman eyləyəm.

Xublara vermişəm din-imanımı,
Şövkətü şanımı, adü sanımı,
Cəllad tək gözləri alsa canımı,
Namərdəm, mən əgər aman eyləyəm.

Vaqifə rəhm eylə, bari ilahi,
Agah et dərdimdən ol üzü mahi,
Qədəm basıb bizə gəlsin nagahi,
Bir gecə mən onu mehman eyləyəm.

*
* *

Bir əndamı nəsrin, dodağı qönçə,
Bir qaməti gülbün yara aşiqəm.
Olsa yüz üzü gül, girməz eynimə,
Mən ancaq bir gülüzara aşiqəm.

Gecələr sübhədək eylərəm nalə,
Hərgiz düşməz könlüm özgə xəyalə,
Bir gərdəni mina, ağzı piyalə,
Bir ləhcəsi şirinkara aşiqəm.

Bir buxağı turunc, sinəsi meydan,
Bir sözü cəvahir, mirvari dəndan,
Bir maral baxışlı, kirpiyi peykan,
Bir qaşları zülfüqara aşiqəm.

Bir güləndə ləblərindən bal axan,
Bir bəzənib sərxoş tovus tək çıxan,
Bir niqab altından pünhani baxan,
Bir əcayib xoşgöftara aşiqəm.

Vaqifəm, bədəndən canım dağılır,
Məcnun kimi xanimanım dağılır,
Görməyəndə din-imanım dağılır;
Gecə-gündüz mən didara aşiqəm.

*
* *

Bəhanə tutuban, bizdən gen gəzmə;
Sirr sözün yadlara deyən deyiləm.
Könül rəva görməz səni yad görə,
Səni özgəsinə qıyan deyiləm.

Arzum budur, gözüm tikəm gözünə,
Danışasan, qulaq verəm sözünə,
Ta ölüncə baxım günəş üzünə,
Arzum canda qalıb, doyan deyiləm.

Vaqif deyir, doymaz sevən sevəndən,
Ta ölüncə əl götürmənəm səndən,
Əbəs-əbəs neçün qaçırsan məndən,
Mən ki, zalım, adam yeyən deyiləm.

*
* *

Yenə məni yanar-yanar odlara,
Dağılmış ayrılıq saldı, sevdiyim!
Mən ha getdim möhnət ilə, dərd ilə,
Can sənin yanında qaldı, sevdiyim!

Siyah zülfün buxaq altda qayrılır,
Ala gözlər can almağa sayrılır,
Canandan ayrılan candan ayrılır,
Xalq içində bir misaldı, sevgilim!

Sərv qəddin sənubərə tən deyil,
Tamam sənin təkin gülbədən deyil,
Dəxi əzəlki tək sən görən deyil,
İndi halı yaman haldı, sevdiyim!

Qaşların qurulu yay tək çəkilir,
Kirpiklərin dəyir, ciyər sökülür,
Danışanda qəndü şəkkər tökülür,
Dilin, dodaqların baldı, sevdiyim!

Ol Xədicə haqqı, Səkinə haqqı,
Xeyrənnisə haqqı, Əminə haqqı,
Kəbə, Məkkə haqqı, Mədinə haqqı,
Dərdin bu Vaqifi aldı, sevdiyim!

*
* *

Ey cavan qız, məndən belə gəzmə gen,
Mən sənin üzündə xalı sevmişəm.
Bənd olmuşam şirin-şirin sözünə,
Şəkkər dodağında balı sevmişəm.

Üzün ağ, dəyirmi, gözün məstana,
Baxışın bağrımı döndərdi qana,
Ağzın sədəf, dişlərindir dürdana,
Əcayib cəvahir, ləli sevmişəm.

Qaşların çəkili yaylara dönür,
Ağlaram, göz yaşım çaylara dönür,
Bəzənir, illərə, aylara dönür,
Canlar alan bir maralı sevmişəm.

Həlqələnir zülfün buxaq yanında,
Yay qaşların ucu qulaq yanında,
Zənəxdan içində, yanaq yanında,
Qara telli bir xətalı sevmişəm.

Çox gözəlsən, amma xoyundur yaman,
Baxmazsan üzümə mənim çox zaman,
Vaqif deyir, sənin əlindən aman!
Mən biçarə nə havalı sevmişəm!

*
* *

Ey üzü gül, qəddi tuba Safiyə,
Həsrətindən mən şeydaya dönmüşəm.
Qaşların əyrisin yad eylədikcə,
Qamətim əyilib yaya dönmüşəm.

Sözün heç ayrılmaz mənim sözümdən,
Odlara yanmışam özüm-özümdən.
Ol qədər yaş tökdüm iki gözümdən,
Dərya tək axıban çaya dönmüşəm.

Sən gözəlsən, gəşt edirsən bağ ilən,
Ağ gülə oxşarsan əl-ayağ ilən,
Günəş camallısan gül yanağ ilən,
Mən incəlib yengi aya dönmüşəm.

Gözün şuxdur sənin – bənzər cəllada,
Məni tərk eyləyib, uyma gəl yada,
Sən gər mənim olsan fəna dünyada,
Elə billəm, padişaha dönmüşəm.

Ləhcən, sözün bir əcayib ləhcədir,
Işin tamam şivə, nazü qəmzədir,
Mən Vaqifəm, kuyin mənə Kəbədir,
Şükrilillah, müsəllaya dönmüşəm.

*
* *

İndən belə ölsəm, arzu çəkmənəm,
Şükr Allaha, arzumana yetişdim.
Dostun camalına nəzər eylədim,
Sanasan, tazədən cana yetişdim.

Siyah vəsmə zivər çəkibdir qaşa,
Onu görən gözlər istər qamaşa,
Bir ləhzə hüsnünə etdim tamaşa,
Behəmdüllah, din-imana yetişdim.

Gözəllikdə bənzəyir Züleyxaya,
Yanaqları oxşar güli-həmraya,
Könül pərvaz etdi qalxdı havaya,
Yer üzündən asimana yetişdim.

Cari olub xublar gəlsə bittəmam,
Olmaz belə gözəl, belə xoşəndam,
Qan ağlayıb, həsrət çəkən sübhü şam,
Bülbül kimi gülüstana yetişdim.

Hər dəm oynadanda gözü qaşını,
Gətirər firəngin tər savaşını,
Nə fayda, vermədim tez şabaşını,
Vaqif deyir, çox peşmana yetişdim.

*
* *

Çox zamandır, yarın həsrətindəyəm,
Gələydi, bir onu barı görəydim,
Bülbül tək fəryadım çıxdı fələkə,
Cənnət iyli gülüzarı görəydim.

Basaydı üzümə gül ayağını,
Öpəydim üzünü, həm dodağını,
Gah açaydım ağ sinənin bağını,
Qoynundakı qoşa narı görəydim.

Gah alaydım gərdənini qucağa,
Gah üzüm sürtəydim zülfə, buxağa,
Gah da oturaydım qabaq-qabağa,
Danışaydı, xoş göftarı görəydim.

Bilirmola bağrımdakı yaranı,
Necə yaxmış mən tək günü qaranı,
Yar məndən kəsməzdi belə aranı,
Bu qoymayan kimdir, barı, görəydim.

Vaqifəm, hicrandır mənim məhşərim,
Gecə-gündüz canan olmuş əzbərim,
Kərəm eyləyibən gəlsə dilbərim,
Kəsilirmi ahu zarı görəydim?

*
* *

Sevdiyim alaydı üzündən niqab,
Bir də baxıb o cəmalı görəydim.
Tamaşa edəydim qaşa, qabağa,
Həlqə zülfü, xətti, xalı görəydim.

Olmuşam mən ona aşiqi-didar,
Tapılmaz bir belə gözləri xumar,
Ləbindən nuş etmək xəyalımda var,
Yar bilirmi bu xəyalı, görəydim.

O xublar sərvəri, sərxoş səlatın,
Açaydı sərasər gözəl süfatın,
Qoyaydı əməydim qəndin, nəbatın,
Ağzındakı şəkər, balı görəydim.

Könlünü ayna tək eyləyəydi pak,
Bir söz desəm, olmayaydı qəzəbnak,
Duraydı qarşımda sərxoş, sinəçak,
Xoşiqbaldır, o iqbalı görəydim.

Gah narın dərəydim, gah güllərini,
Gah siyah zülfünün sünbüllərini,
Gah da bir tutaydım ağ əllərini,
Vaqif der, nə mülkü malı görəydim.

*
* *

Əldə ayna, gözə sürmə çəkəndə,
Ala gözün bulağından öpəydim.
Zənəxdanın çevrəsindən, xalından,
Qələm qaşın qabağından öpəydim.

Zülf ilən bəzənib gələndə üzün,
Qəsd edir yenə can almağa gözün,
Vəsfi-zəbanından çıxanda sözün,
Dilin, dişin, dodağından öpəydim.

Alaydım yaşmağın, açıb kəmərin,
Çıxarıb əynindən zərbafın, zərin,
İyləyib-iyləyib zülfi-ənbərin,
Üzdən sonra buxağından öpəydim.

Gecə-gündüz duam budur Tarıma,
Nola səni sala bir güzarıma,
İyləyib-iyləyib basam bağrıma,
İki gülgəz yanağından öpəydim.

Vaqifin bağrını döndərdin közə,
Yar odur ki, yarın cövrünə dözə,
Yarım sallanıban gələndə bizə,
Düşübən əl-ayağından öpəydim.

*
* *

Sənin təki siyah telli, gül üzlü,
Bu cümlə cahanda mən görməmişəm.
Ağzı nazik, qaşı uzun, qəddi düz,
Bir belə sinəsi gen görməmişəm.

Bir mah üzlü sevdim keçən sənədə,
Xırda xallar zənəxdanda, çənədə,
Vilayəti gəzdim, heç kimsənədə
Bir belə şövkətü şan görməmişəm.

Gözəllər içində türfə, ali şan,
Deyib, gülüb şirin-şirin danışan,
Çox görmüşəm siyah zülfü pərişan,
Amma ki, qəddinə tən görməmişəm.

Sədəf dəhanında dişlərin düri,
Dəyər bu dünyaya onun hər biri.
Ya mələksən, ya hurisən, ya pəri,
İnsanda sən təki can görməmişəm.

Xəncər kirpiyindən saçılır qanlar,
Sənə qurban yüz min qaşı kamanlar,
Durub sallananda üzülür canlar,
Vaqif deyər belə xan görməmişəm.

*
* *

Baxıb camalına qürur eyləmə,
Sən də bir yol-ərkan gözət, sevdigim!
Yarın dili şirin gərək, üzü xoş,
Edə aşiqinə izzət, sevdigim!

Gözəl çoxdur, mələk, pərizad da var,
Gəlsin görüm, hansı sən süfatda var.
Nə şəhdi-şəkkərdə, nə nəbatda var
Ləblərində olan ləzzət, sevdigim!

Həlqə qoy üzünə zülfi-pürtabı,
Görənlər bəyənsin, desin hesabı,
Altdan gülgəz, üstdən yaşıl türabı,
Bu rəng ilən özün bəzət, sevdigim!

Əndamın güldür, ey sənəm, sərasər,
Istərəm başına dönəm sərasər,
Dəlik-dəlik oldu sinəm sərasər,
Qəmzə oxun mənə az at, sevdigim!

Vaqif tək dərdimənd az düşər ələ,
Nə fayda, qədrini bilmədin hələ.
Üzünü bürüyüb örtmə gəl belə,
Mənimlə özünü düzəlt, sevdigim!

*
* *

Sallana-sallana dövlətxanadan,
Bir çıxa boyinə qurban olduğum.
Göydə mələk, yerdə insan gözəli
Sənsən, xoş xoyinə qurban olduğum.

Hüsnün kitabını bülbüllər oxur,
Yay qaşın bağrıma xədəngin toxur,
Həlqə birçəyindən yasəmən qoxur,
Bənəfşə muyinə qurban olduğum.

Ləblərin şirindir şərbətdən artıq,
Üzünü görməkdir dövlətdən artıq,
Eşiyindir sənin cənnətdən artıq,
Kəbeyi-kuyinə qurban olduğum.

*
* *

Ey mələk xoylu, ey tuba boylu yar,
Kuyindir cənnəti-rizvanım mənim.
Huri qılman olsa, girməz gözümə,
Sənsən candan əziz cananım mənim.

Pərim, sənubərim, gülbərgi-tərim,
Gövhərim, yaqutum, ləli-əhmərim,
Hekayətim, fikrim, zikrim, əzbərim,
Xəyalımda şirin nihanım mənim.

Xurşidi-rüxsarəm, qəmər cəbinim,
Baharım, gülzarım, xüldi-bərinim,
Yarım, qəmküsarım, xoş nazəninim,
Gözəlim, göyçəyim, cavanım mənim.

Vəhdətim, xoşgünüm, söhbətim, dəmim,
Fəğfurum, qeysərim, Cəmşidim, Cəmim,
Xosrovum, xaqanım, şahi-əzəmim,
Padşahım, həm əla sultanım mənim.

Zövqüm, səfam, seyrim, bağım, çəmənim,
Süsənim, sünbülüm, laləm, səmənim,
Xətavü Xütənim, Çinim, Yəmənim
Hindustanım, Rumum, Iranım mənim.

Sözüm, ixtilatım, hər qalü qilim,
Mətləbim, muradım, xatirim, meylim,
Şəkkərim, Şirinim, Gülşahım, Leylim,
Züleyxam, Yusifi-Kənanım mənim.

Həblülmətin zülfün, Kəbə üzündür,
Mehrabım, mənbərim qaşın, gözündür,
Vaqifəm, ey sənəm, sənin sözündür
Gecə-gündüz fikrü xəyalım mənim.

*
* *

Bədənin sərasər gül xərmənidir,
Qamətin gözəldir, gözəl, sevdigim!
Heç nə istəmənəm iki dünyada,
Sənsən mənim axır-əzəl, sevdigim!

Qul vermişəm bu canımı canına,
Harda olsam, könlüm gələr yanına,
Nə qədər söyləsəm sənin şanına,
Yaraşar müxəmməs, qəzəl, sevdigim!

İraq durma, məndən cüdayı gəzmə!
Sevirsən, ey nazlım, xudayı gəzmə!
Əyri otrub, belə kinayı gəzmə,
Gəl indi mənimlə düzəl, sevdigim!

Ahımı göylərə hər səhər çəkdim,
Kəm çəkmədim, amma mötəbər çəkdim.
Qoynunda nar dərdi ol qədər çəkdim,
Oldu rəngim axır xəzəl, sevdigim!

Xumar gözlərini oyaq qoymasan,
Yıxılan könlümə dayaq qoymasan,
Dərman eyləməyə ayaq qoymasan,
Şikəstə Vaqifdən üz əl, sevdigim!

*
* *

Onun üçün uymaz qeyriyə könlüm,
Bir əcəb zibadır mənim sevdigim.
Huri nədir, qılman nədir, mələk nə,
Hamıdan əladır mənim sevdigim.

Zülfləri sünbüldür, yanağı lalə,
Baxışı tən edir vəhşi qəzalə,
Gözləri məstanə, ağzı piyalə,
Gərdəni minadır mənim sevdigim.

Ayna tutar, zənəxdana gül düzər,
Hər muyinə yüz min fitnə-fel düzər,
Bəyaz gərdəninə siyah tel düzər,
Sanasan sonadır mənim sevdigim.

Boyu yaraşıqlı sərvi-xuraman,
Əndamıdır ağ gül, sinəsi meydan,
Kəlağayı gülgəz, libası əlvan,
Bir güli-rənadır mənim sevdigim.

Vaqifəm, zülflərin bəndivaniyəm,
O kaman qaşların mən qurbaniyəm,
Mənə qədr elə kim, gövhər kaniyəm,
Demə ki, molladır mənim sevdigim.

*
* *

Səfalar gətirib, təşrif buyurdun,
Qədəm basdın bizə, qurban olduğum.
Az qala ki, sənin həsrətin bizi –
İncəltmişdi – üzə, qurban olduğum.

Sən gəldin, nur doldu evə-otağa,
Gəldiyin yollara canım sadağa,
Durub qurban olmaq sən tək qonağa
Nuşdur canımıza, qurban olduğum.

Mən mayiləm, səndən düşmənəm çaşa,
Bulut zülfə, ağ qabağa, ay qaşa,
Qoy doyunca baxsın, etsin tamaşa,
Heyrandı göz-gözə, qurban olduğum.

Sən qəddinə yaşıl-allar geyici,
Vaqif dəxi sənə qəzəl deyici,
Şükr Allaha, deyil adamyeyici,
Nolur gəlsən bizə, qurban olduğum.

*
* *

Mənim yarım sığallanıb gələndə,
Sanasan qan süzür dodaqlarından.
Şölə verir zənəxdanın çevrəsi,
Nur tökülür göyçək yanaqlarından.

Gərdən çəkib, tənə qılar qulara,
Həsrətindən bağrım dönər sulara,
Pərilər evladı derlər bulara,
Bular da gözəldir ocaqlarından.

Ağ sinən gözəldir, gərdən gözəldir,
Sərasər əndamın birdən gözəldir,
Sərv qəddin sənubərdən gözəldir,
Qolların, topuğun, buxaqlarından.

Dəhanın sədəfdir, dişlərin inci,
Sən məni eylədin ellər gülüncü,
Libasın əlvandır, çarqat narıncı,
Saçaqlar yaraşır qıraqlarından.

Vaqifin dərdini biləydi yarı,
Dərdinə bir dərman qılaydı yarı,
Qədəm basıb müdam gələydi yarı,
Öpəydim əlindən, ayaqlarından.

*
* *

Zülfün başı taxtalanıb qabaqda,
Qıraq verir qəsabənin altından.
İlan quyruğu tək qoşa qıvrılmış,
Ucu çıxmış zənəxdanın altından.

Qaşın işarəsi, gözün xumarı,
Hər birisi yüz min fil kəməndarı;
Tər sinədə ağ məmənin kənarı,
Şölə verir giribanın altından.

Sənin hüsnün mat eyləyib fələyi,
Cənnətdə hurini, göydə mələyi,
Qızıl qolbaqları, yanar biləyi
Qucaqlayıb kəhrübanın altından.

Aparıbdır məndən ruhi-rəvanı,
Tamam ağlı, huşu, dinü, imanı,
Ağaranda gülgəz yanağın yanı,
Titrər zülfi-pərişanın altından.

Vaqifəm, canana göndərdim peyğam,
Gözüm yollarında qaldı sübhü şam,
Gəlmədi ol sərv qəddi güləndam
Bir çıxaydıq bu hicranın altından.

*
* *

Ey zülmü çox, qəlbi qara biiqrar,
Utanmazsan, amma heç utanmazsan!
Nə anlağın vardır, nə bir kəmalın,
Onun üçün hərgiz sözü qanmazsan!

Nə hürkürsən məndən, dönüb ovlara,
Dad eylərəm, yetişməzsən hovlara,
Sən də mənim kimi bu alovlara
Axır yanacaqsan, demə yanmazsan!

Görüm, sənin nədən oldu əyərin,
Məndənmidir, ya qeyridən çəkərin,
Ay bimürvət, məgər daşdır ciyərin,
Müdam sızıldaram, heç usanmazsan!

Lənət gəlsin o hüsnünün bağına,
Salmanam gözünü bağrım yağına,
Dözürsən döz bu ayrılıq dağına,
Mən dayannam, amma sən dayanmazsan!

Vaqif, lənət gəlsin yarın canına,
Nə dərdinə meyl et, nə dərmanına,
Onun təki bivəfanın yanına,
Əgər igid olsan, heç dolanmazsan!

*
* *

Gülgün sərəndazın təzə gül kimi,
Əfşan etmiş ay qabağın üstündən.
Yanağın yanında zülfə tov vermiş,
Ucun salmış tər buxağın üstündən.

Gah zaman başına tirmə şal bağlar,
Gah olur ki, zülf gizləyib, xal bağlar.
Kəlağayın qabağına al bağlar,
Yaşılın altından, ağın üstündən.

Nə gözəl adamsan, ay qaşları yay,
Heç novcəvan gələ bilməz sənə tay,
Güləbatın qıydır, yoxsa yengi ay,
Öpər, qucar gül yanağın üstündən.

Bizim ilə olub haçaqdan aşna,
Genə hər göründə istər yaşına,
Hicab eylər, kətan salır başına,
Oğrun baxar o yaşmağın üstündən.

Vardır şirin-şirin xoş ixtilatın,
Nə fayda, Vaqifə yox iltifatın,
Tovus qanadı tək ucu çarqatın,
Pərvaz eylər solu-sağın üstündən.

*
* *

Namə, gedər olsan yarın kuyinə,
Dərdi-dilim o canana degilən!
Bülbülüyəm qönçə gülündən ayrı,
Bağrım dönüb qızıl qana, degilən!

Qurban olum kirpiyinə, qaşına,
Sel oluban qarış axan yaşına,
Pərvanələr kimi dolan başına,
Atəş tutub yana-yana, degilən!

Din-imanım düz ilqara bağlıdır,
Həsrət canım bir cüt nara bağlıdır,
Mürği-ruhim zülfi-yara bağlıdır,
Çox çəkməsin zülfə şana, degilən!

Qılmış hüsnün şövqü dərdimi əfzun,
Ayrılıq qəmində göz yaşım Ceyhun,
Ağlım başdan getmiş, olmuşam Məcnun,
Bu Vaqifə sən divana degilən!

*
* *

Bir fitnə fellinin, üzü xallının,
Bir şirin dillinin qurbanıyam mən.
Bir qənd məqallının, ləb zülallının,
Bir ağzı ballının qurbanıyam mən.

Bir süsən muylunun, səmən boylunun,
Fəriştə xoylunun, mələk soylunun,
Bir cənnət kuylunun, tuba boylunun,
Bir şümşad qollunun qurbanıyam mən.

Bir gözü şərlinin, cəng nəzərlinin,
Zülfü ənbərlinin, müşk tərlinin,
Bir səmənbərlinin, zər kəmərlinin,
Bir incə bellinin qurbanıyam mən.

Bir çox ülfətlinin, məhəbbətlinin,
Bir mərhəmətlinin, şəfəqqətlinin,
Bir pəri tellinin, gün tələtlinin,
Bir məhcəmallının qurbanıyam mən.

*
* *

Ey kirpiyi xəncər, qaşı zülfüqar,
Nöşün məndən xəyalını kəsibsən?
Qoymazsan baxmağa xəttü xalına,
Tamaşayi-cəmalını kəsibsən!

Səg rəqibin fitnəsinə uyubsan,
Neyləmişəm, məndən nə tez doyubsan,
Gecə-gündüz məni təşnə qoyubsan,
Şirin ləbdən zülalını kəsibsən.

Yaşınıbsan, tamam durubsan gendə,
Zülfün yaşmaq altda, saçın gərdəndə,
Görünməz, hər yerin salıbsan bəndə,
Bu qalını, o qalını kəsibsən.

Bu boyda, qamətdə, şövkətdə, şanda
Sən tək gözəl yoxdur cümlə cahanda,
Sərasər bağrımı, keçən zamanda
Göstəribsən hilalını, kəsibsən.

Məgər ki, aşiqin qəmin yeməzsən,
Bu cövrü cəfadan sən inciməzsən,
Xəstə Vaqif, halın nədir? – deməzsən
Cavabını, sualını kəsibsən.

*
* *

Öyünməsin kimsə, gözələm, deyib
Ayrı təhər olur halı gözəlin.
Güləş üzlü, şirin sözlü xoşqılıq,
Ləblərindən axar balı gözəlin.

Qaşı tağ-tağ gərək, qabağı nazik,
Ağzı, burnu, dili, dodağı nazik,
Baldırları yoğun, ayağı nazik,
Var əndamı olur dolu gözəlin.

Yanağı gül, zülfü yasəmən gərək,
Məməsi dik, ağ sinəsi gen gərək,
Haldan xəbər verən, dərdbilən gərək,
Heç olmaya məkrü alı gözəlin.

Yumrola buxağı, gen ola üzü,
Çox dərdmənd ola, dərd bilə özü,
Gündə sürmələnə məstanə gözü,
Əli ola al hənalı gözəlin.

Özgə ilən hərgiz olmaya işi,
Qafiyə, qəzəldən həm çıxa başı,
Bulaq tək qaynaya həm gözü qaşı,
Artıq ola həm kəmalı gözəlin!

Gözəl gərək əl götürə cəfadən,
Ləzzət görə hər dəm zövqü səfadən.
Vaqifəm, qaçaram mən bivəfadən,
Qurbanıyam bir vəfalı gözəlin.

*
* *

Qədəm basdın, sən səfalar gətirdin,
Gözüm üstə, ey məstanə, xoş gəldin!
Başü canım sənin payəndazındır,
Peşkəşindir bu qəmxanə, xoş gəldin!

Təşrif ki, buyurdun götürdün qədəm,
Gərəkdir payinə üz nisar edəm,
Dolanam başına, dönəm dəmbədəm,
Nə ki, qulluğundu – sana, xoş gəldin!

Mən qurbanam zülfündəki gülaba,
Qoxusu tən edir ol mişki-naba,
Məni dərdin döndərmişdi kəbaba,
Qalmış idim yana-yana, xoş gəldin!

Oxlar vurdun mənə gözü qaş ilən,
Namələr yazardım qanlı yaş ilən.
Buyur, ta bəndəlik edim baş ilən,
Hər nə qulluğundur, cana, xoş gəldin!

Mən Vaqifəm, şükür, yetdim murada,
Dəxi arzum yoxdur fani dünyada.
Çox-çox kərəm etdin, ey hurizada,
Yetirdin dərdi dərmana, xoş gəldin!

*
* *

Dərdin məni heyvalara döndərdi,
Ey saçları siyah, üzü ağ gəlin!
Ta ki, gördüm camalının şöləsin,
Əridi bağrımda tamam yağ, gəlin!

Sənin həsrətini vilayət çəkər,
Qəmzən yayı dəyər, məlalət çəkər,
Camalından mələk xəcalət çəkər,
Hüsnün eylər aya, günə lağ, gəlin!

Nə olur, üzündən niqab alasan,
Bir ləhzə halıma nəzər salasan,
Səhərdən açılmış təzə lalasan,
Sənin seyrangahın olur dağ, gəlin!

Qəddin tək nə ər-ər, nə şümşad olur,
Onu görcək, qəmdən can azad olur,
Mənim könlüm sənin ilən şad olur,
Sən eylərsən damağımı çağ, gəlin!

Bəlalərdən səni saxlasın xuda,
Sən tək gözəl eldən olmasın cüda,
Xəstə Vaqif ölsə, başına fəda,
Təki olsun sənin canın sağ, gəlin!

*
* *

Düyün oldu, bütün xublar yığıldı,
Gəlmədi bir bizim gülbədən gəlin.
Sən gəlmədin deyin, yasa batmışam,
Gələ gör, ey zülfü yasəmən gəlin!

Bir qədəm bas ki, toy sənin toyundur,
Toylar yaraşığı sənin boyundur,
Mollalar məskəni səri-kuyundur,
Onu görən dönər Kəbədən, gəlin!

Cam içmişəm mən, məstanə gəlmişəm,
Eyləyib bağrımı şanə gəlmişəm,
Sənin həsrətindən canə gəlmişəm,
Əl götür bu nazü qəmzədən, gəlin!

Saz tutulub yüz min sənəm oynasa,
Cəm oluban rumü əcəm oynasa,
Göydə mələk, yerdə adəm oynasa,
Həzzim olmaz hərgiz özgədən, gəlin!

Gəl oyna, əlinə kələğay dola,
Buyur, şabaş versin, Vaqif tək qula!
Mat qalıb desinlər: kimindir ola
Kəklik kimi səkib, bu süzən gəlin!

*
* *

Siyah zülfün qəddin ilən bərabər,
Nazik ağ əndamın bəyaz qar, gəlin!
Sallanışın tamam cahana dəyər,
Sənin tək bir gözəl harda var, gəlin!

Məlayiklər gəlir səni salama,
Qəmzən məni çapdı, gəl bax yarama.
Şəkkər qübbəsidir, yoxsa şamama,
Qoynun içindəki qoşa nar, gəlin?

Səni sevən əqli, kamalı neylər,
Dəxi görmüş özgə cəmalı neylər,
Bu dünyada mülkü o, malı neylər,
Hər kim olsa sənin ilən yar, gəlin!

Geyibsən əyninə gül pirəhəni,
Cəmalın şöləsi tutmuş dövrəni,
Nagəhdən gözlərim görəndə səni,
Qalmadı canımda ixtiyar, gəlin!

Həsrətindən Vaqif düşdü dərdə, gəl,
Heç əylənmə irəlidə, gerdə, gəl,
Bir gəlibsən, kərəm eylə, bir də gəl,
Könlüm çəkir sənə intizar, gəlin!

*
* *

Xumar gözlərini sevəndən bəri,
Dəxi özgəsinə uymanam, gəlin!
Xoryat ilə belə can-can olmusan,
Məgər ki, mən onu duymanam, gəlin!

Cəfridar sürməni çəkibdir gözə,
Havalanıb dəxi endirməz bizə,
Mən ha billəm, qanın qaynar tüksüzə,
Mən tutduğum əldən qoymanam, gəlin!

Başına döndüyüm, suların yolu,
Gedəndə boş gedir, gələndə dolu.
Məmələrin üstdən çatının zolu, –
Sən qıysan, mən sənə qıymanam, gəlin!

Başına döndüyüm, telli, toqqalı,
Qaşların canımı haq-nahaqq alı,
Ağarıbdır, qırxmaq olmaz saqqalı,
Vallah, üzün üstə qoymanam, gəlin!

Taxtına çıxmanam, taxtın ucadır,
Qoynuna girmənəm, yarı gecədir,
Deməginən Molla Pənah qocadır
Səni tamam yesəm, doymanam, gəlin!

*
* *

Bir sən kimi gözəl yoxdur dünyada,
Ağzı şirin, dili-dodağı şirin.
Doymaq olmaz didarından bir zaman,
Tamaşası, qaşı, qabağı şirin.

Siyah zülfü üz yanına dolanmış,
Onun hər muyinə yüz can calanmış,
Sanasan, şəkkərə, qəndə bulanmış
Məməsi, sinəsi, buxağı şirin.

Tərpənəndə hər tərəfə gül qoxar,
Müşkü ənbər qoxar, siyah tel qoxar,
Basdığı yerlərdən mixək, hil qoxar,
Nazik əli şirin, ayağı şirin.

Qaşlar vəsmələnir, göz sürmələnir,
Köz tək yanaqları xoş şölələnir,
Baxdıqca üzünə can cilvələnir,
Olur bu Vaqifin damağı şirin.

*
* *

Nə gözəl sürmədən cila gətirdi,
Döndü bir afəti-cana gözlərin.
Apardı ağlımı, din-imanımı
Sənin belə bu məstanə gözlərin.

Qəmzə tiğin çəkdi, çaldı canımı,
Bir cəllada döndü, aldı canımı,
Genə yanar oda saldı canımı,
Qoydu məni yana-yana gözlərin.

Ala gözlər xumarlanır, süzülür,
Hər qıya baxanda, canım üzülür.
Müjganların sinəm üstə düzülür,
Meyl edəndə bu məkana gözlərin.

Hüsnün gülə bənzər, boyun minayə,
Canım qurban olsun belə sonayə,
Kirpiyin xədəngin vurdu sinayə,
Etdi bağrım şana-şana gözlərin.

Xəyalın könlümdə, gözümdə gəzər,
Xumar-xumar baxar, canımı üzər,
Şikəstə Vaqifdən kəsməsin nəzər,
Rəhm eyləsin mən mehmana gözlərin.

*
* *

Gərdənində, qamətində ayıb yox,
Amma nə gözəldir pərişan zülfün!
Ətrindən dinlənir sərasər ərvah,
Ya müşki-ənbərdir, ya reyhan zülfün.

Gülab səpilibən dəyəndə şana,
Qoxusu çulğaşır cümlə cahana,
Döndəribdir məni Şeyx Sənana,
Nə din qoyub məndə, nə iman züfün.

Ağ əlin ki, dəyər o müşki-naba,
Bənzər bulut içrə girən məhtaba.
Həlqələnir, dönür ucu qüllaba,
Asar gündə min-min dilü can zülfün.

Yastılanıb ay qabağın yanında,
Başı çıxır tər buxağın yanında,
Siyah xalın, al yanağın yanında
Əksik olmaz hərgiz, hər zaman zülfün.

Vaqifəm, olmuşam zülfə giriftar,
Könlüm viran, halım xarab, günüm zar,
Bir nəzər qıl mənə, ey çeşmi-xumar,
Eyləyibdir məni sərgərdan zülfün.

*
* *

Ey Məkkəni, Mədinəni yaradan,
Bir fikir çək əhvalına Vaqifin.
Ol qaşı qibləyə üz sürtmək istər,
Mədəd eylə iqbalına Vaqifin.

Gözündən irağa düşübdür yarı,
Kəsilib könlünün səbrü-qərarı.
Üz çevirmiş yenə Mədinə sarı,
Nə düşübdür xəyalına Vaqifin.

Mənim yarım deyil ol Kəbədən kəm,
Xal həcərül-əsvəd, dəhanı zəm-zəm,
Bir zaman olsaydım onunla həmdəm,
Xət çəkilər vəbalına Vaqifin.

Sərxoş durub mina boylu sağıdan,
Yaralıdır qəmzəsi ol yağıdan.
Zülfü ənbər – ağlı başdan dağıdın;
Nə sözü var kamalına Vaqifin.

Yüz zülfü pərişan, hindu xal olsa,
Yüz şəkər göftarlı, ləbi bal olsa,
Yüz şirindil, ənbərbu maral olsa
Yetə bilməz maralına Vaqifin.

*
* *

Yenə bayram oldu xublar bəzəndi,
Sanasan, açılıb tazə gül bu gün.
Bənəfşə zülfləri alasan ələ,
Şanə tək gəzəsən telbətel bu gün.

Kim ölə, kim qala bu bayramadək,
Cəhd eylə, yetəsən gül əndamadək,
Gecələr sübhədək, ta axşamadək,
Yarın gərdənində ola qol bu gün.

Sanasan, üzünü ərəq nəmidir,
Elə bahar fəsli, gül şəbnəmidir,
Ixtilat bazarı, söhbət dəmidir,
Gərək düşə dost kuyinə yol bu gün.

Tamaşa qılasan qaşa, qabağa,
Sürtəsən üzünü zülfə, buxağa,
Yar bəzənib gəlir canlar almağa,
Ölməli günündür, Vaqif, öl bu gün.

*
* *

Məni qərq eylədin qəm dəryasına,
Ey çeşmi-xumarım, nöşün ağladın?
Ey gözüm, nə dəyib köyrək könlünə?
Ey şirin göftarım, nöşün ağladın?

Gərdənində zülfün tər sünbül kimi,
Sonadan üzülmüş qaratel kimi,
Sən gərək güləsən qızılgül kimi,
Ey lalə rüxsarım, nöşün ağladın?

Olmaya sən məni biiqrar sandın,
Zarafat eylədim, ona inandın,
Nə dəydi könlünə, nədən bulandın,
Dişləri mirvarım, nöşün ağladın?

Bağrım başın şan-şan eylədin, dəldin,
Dönüm gözlərinə, az ağla – öldün;
Deyərdin, gülərdin, belə deyildin,
Mənim cadugərim, nöşün ağladın?

Hər kəs görən dəmdə öz sirdaşını,
Məgər tökər qabağını-qaşını?!
Oda yaxdın ciyərimin başını,
Vaqif der: dildarım, nöşün ağladın?

*
* *

Başına döndüyüm, toy adamları,
Siz də deyin: toya gələn oynasın,
Adını demərəm, eldən ayıbdır,
Filankəsin qızı, filan oynasın.

Nə müddətdi ona güvənən bizik,
Həsrətin çəkməkdən canımız üzük,
Hər əlinə alıb bir danə üzük,
Üzüyü dəstinə alan oynasın.

Bir tuba boyludur; boyu novrəstə,
Həsrətin çəkməkdən olmuşam xəstə,
İşarət eylərəm anlayan dosta,
Dostunun qədrini bilən oynasın.

Mən Molla Vaqifəm, eylərəm əfğan,
Gözlərim də yaş yerinə tökər qan,
Uzun boylu, yeniyetmə, novcavan, –
Məni bu dərdlərə salan oynasın.

*
* *

Oğrun baxa-baxa, ey çeşmi nərgis,
Dərdə saldın məni, xəstəhal etdin,
Həsrətindən öldüm, öldüm, dirildim,
Nə bir yada saldın, nə sual etdin.

Hər məni görəndə. ey çeşmi yağı,
O qədər eylədin canlar almağı,
Gah göstərdin, gah gizlətdin yanağı,
Axır məni dərdə saldın, al etdin.

Uzun illər sənə qaldım mən həsrət,
Zərrəcə görmədim mehrü məhəbbət,
Hər zaman ki, səndən umdum şəfəqqət,
Bir dava başladın, qalmaqal etdin.

Əzəldən var idi lütfü kərəmin,
Gahbəgah bəriyə seyrü qədəmin,
Vara-vara artdı zülmü sitəmin,
Bilmədim, sonradan nə xəyal etdin!

Həmişə bu idi fikrü xəyalım,
İkimiz bir yerdə həmdəm olalım.
Neyləmişdi sənə Vaqif, a zalım,
Onu qəm əlində payimal etdin.

*
* *

Bir bəyaz gərdənli, mərmər sinəli,
Gərdəninə qurban minalar olsun,
Ucu tər cığalı siyah tellərin
Sədqəsi yaşılbaş sonalar olsun.

Nə dedim mən sənə, ey üzü mahım,
Sən məndən küsübsən, ey qibləgahım.
Öldür məni, gər var isə güahım,
Al qanım əllərdə hənalar olsun.

Necə ki, görürsən özün filməsəl,
Camalındır cahan içrə bibədəl,
Özün kimi gərək xoyun da gözəl,
Səndə neçün belə ədalar olsun?

Dost dost ilə əbəs yerə savaşmaz,
Sevənin sevəndən könlü bulaşmaz,
Bikef olmaq gözəllərə yaraşmaz;
Gözəldə gərək xoş səfalar olsun.

Eşitdim küsübsən, tərpəndi dərdim,
Yalvarıb könlünü almaq istərdim,
Qulluğuna namə yazıb göndərdim,
Bizdən sənə çox-çox dualar olsun.

Vaqif, canan ilə tər oldu ara,
İmdad sənə qaldı, eylə bir çara,
Bir qafiyə qayır, göndər ol yara,
Bəlkə dərdimizə dəvalar olsun.

*
* *

Ay kənarı qabağında qıy kimi,
Görünür, çulğanır yanağa zülfün.
Sanasan bulutdur, ənvər üzünü
Bədr ayı tək almış qucağa zülfün.

Şahmar təki gərdənində bulanır,
Gülab ilə sığallanır, sulanır,
Həlqə düşüb, buxaq altda dolanır,
Baş qoyur, sarılır qulağa zülfün.

Ətrin götürübdür müşkü reyhandan,
Ucu cığalanır çıxır dörd yandan,
Açılanda çarqat tər zənəxdandan,
Nə əcayib durur qırağa zülfün.

Göz doymaz vəsməli kəman əbrudan,
Can üzülməz səmən iyli geysudan,
Məst edir aləmi ənbərin budan,
Hər gələndə səndəl darağa zülfün.

Xəstə Vaqif onun sərgəştəsidir,
Bağrı qızıl qanın ağuştəsidir,
Hər tari müəttər, can riştəsidir,
Qoyma ki, tökülsün ayağa zülfün.

*
* *

Bir mina gərdənli, gül üzlü yarın
Hər axşam, hər səhər yanağından öp.
Durub dolan pərvanə tək başına,
Sığalla tellərin, qabağından öp.

Bir gözəl görmüşəm bu gələn kəştə,
Fərağı başında, sevdası başda,
Hər axşam, hər səhər sultanı çaşda,
Qaldırıb çənəsin, buxağından öp.

Nə ola oxuya, həm yaza Vaqif,
Müştaq olsun gələn bu qıza, Vaqif,
Bir beləsi gəlsə gər sizə, Vaqif,
Eylə səcdə, ikram, ayağından öp.

*
* *

Ey şahı xubların, şuxu dilbərin,
Səndən sənubərin xəcaləti var.
Xoş yaraşır sənə diba nimtənə,
Bu bəzəyin genə əlaməti var.

Bu zibü ziynətin, şanü şövkətin,
Meraci-rifətin, babi-dövlətin,
Hüsnü məlahətin, çeşmi-afətin,
Bu qəddü qamətin qiyaməti var.

Məhbubi-müntəxəb, bir ali nəsəb,
Qəmzəsində qəzəb, sən saxla, yarəb,
Gül rüxlü, qönçələb, turuncu ğəbğəb,
Lisanında əcəb hekayəti var.

Olmaz belə adəm, yığılsa aləm,
Mələkdən mükərrəm, əlavü əzəm,
Özü bir şux sənəm, istiğnası kəm,
Bizə əmma hərdəm nəzakəti var.

Qaşı yay, çeşmi şux, müjganları ox,
Cümlə kəsdən artıx, bərabəri yox.
Camalı yanında ay və gün mənsux,
Vaqifin ondan çox şikayəti var.

*
* *

İntizar çəkməkdən, yol gözləməkdən,
Könlümün nə tabı, nə taqəti var.
Yazan ola ayrılığın dərdini,
Fərhadü Şirincə hekayəti var.

Bir kimsə ki, müştaq ola cəmala,
Görənlər bilir ki, düşər nə hala,
Ol qamətin hər gələndə xəyala,
Görəsən ki, necə qiyaməti var.

Eşqin salır canımıza bir atəş,
Zülfün kimi halımızdır müşəvvəş.
Ey tubiyi-cənnət, sənədir peşkəş
Qarabağın hər nə vilayəti var.

Yüz görsək də əgər özgə hərəmdən,
Qurtulmanıx hərgiz fikrü ələmdən,
Sən gəl xilas eylə bizi bu qəmdən,
Sənin qədəminin səadəti var.

Hicranı çəkməyən dərdimənd olmaz,
Sevəni sevməyən dilpəsənd olmaz,
Dost dosta gələndə yolda bənd olmaz,
Eşqin təriqinin bu adəti var.

*
* *

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz?
Bir xəbər versəniz bizə, durnalar!

Sizə müştaq durur Bağdad elləri,
Gözləyə-gözləyə qalıb yolları,
Asta qanad çalın, qafil telləri,
Heyifdir, salarsız düzə, durnalar!

Xeyli vaxtdır, yarın fərağındayam,
Pərvanə tək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam,
Görünürmü, görün, gözə, durnalar!

Mən sevmişəm ala gözün sürməsin,
Bədnəzər kəsibən, ziyan verməsin,
Saqın gəzin, laçın gözü görməsin,
Qorxuram səfnizi poza, durnalar!

Nazənin-nazənin edərsiz avaz,
Ruhlar tazələnir, olur sərafraz,
Vaqifin də könlü çox edər pərvaz,
Hərdən sizin ilə gəzə, durnalar!

*
* *

Bir bölük yaşılbaş sonalar kimi,
Yığılıb gəlibdir Qazağa qızlar,
Ayna qabağında qara qaş ucun
Endirib gətirmiş qulağa qızlar.

Hər birində mina gərdən, nazik bel,
Sizə qurban tamam ölkə, tamam el,
Gülab ilən sığallanmış qara tel
Xub yaraşmış bəyaz buxağa, qızlar.

Qəmzə kaman, müjgan xədəng, göz ala,
Yüz qan olur, əyri baxsan hilala,
Sözləri qənd, ağızları piyala,
Şəkər əzmiş dilə, dodağa qızlar.

Ey ağalar, necə sitəm etdilər,
Vaqifin canını çox incitdilər,
Yenə durub qatarlaşıb getdilər,
Sözlərin qoydular qırağa qızlar.

*
* *

Müşki çarqat kənarında xumar göz
Süzülər, süzülər, gahbagah baxar.
Heybətindən lərzə düşər canıma,
Sanasan, quluna padişah baxar.

Sürməli gözlərin xoş xədəngi var,
Bir gün məhəbbətin yüz gün cəngi var,
Özgə baxan gözün qeyri rəngi var,
Bu baxanda amma sim-siyah baxar.

Xoyu məlaikdir, özü pərinaz,
Cilvəsi qarıçqay, cıqqası şahbaz,
Çəkibdir üzünə siyah sərəndaz,
Bulut arasından sanki mah baxar.

Qızıl həna qoymuş əl dırnağına,
Qönçələr düzübdür sol və sağına,
Sığal verib yay qaşların tağına,
Şükr Allaha, bizə qibləgah baxar.

Vaqif candan müştaq olur müştağa,
Müştaq olmayandan qaçar irağa.
Baxan baxmaq gərək qabaq-qabağa,
Göz ucilə baxan baikrah baxar.

*
* *

Göz qaldı yollarda, can intizarda,
Gəlmədi canandan tazə bir xəbər.
Mənim taqətim yox qələm tutmağa,
Kim ola ki, yara yaza bir xəbər.

Nə qədər ki, mən ağlaram dəmadəm,
Əhvalım bilirmi ola o həmdəm.
El tamam yağıdır, yoxdur bir adəm,
Verə məndən pərinazə bir xəbər.

Gör hesabın mən çəkdiyim azarın,
Bu dadü fəryadın, bu ahü zarın,
Badi-səba əgər düşsə güzarın
Söylə xəlvət bu həmraza bir xəbər.

Əzəldən qaməti belə deyildi,
Bir yay qaş oxundan sonra əyildi.
Bağrım dəlindiyin hər yetən bildi,
Yetişmədi tirəndaza bir xəbər.

Bülbülü qönçeyi-xəndan öldürdü,
Pərvanəni şəmi-suzan öldürdü,
Vaqifi atəşi-hicran öldürdü,
Aman, verin o şahbaza bir xəbər.

*
* *

Ey cananım, sən bəzənib gələndə,
Ayü gün qarşına pişvaza gedər.
Kəbeyi-kuyinə gündə min kərə,
Mələklər yığılıb namaza gedər.

Ağ gülə təşbehdir bədənin bütün,
Dərdindən aləmə salmışam bir ün,
Səni sevən cavan olur günbəgün
Qarımaz, başatan tər-tazə gedər.

Sənubər qamətin nə xoş xuramdır,
Həsrətindən sızıldayan yaramdır,
Səndən ayrı dirlik mənə haramdır,
Axır bir gün ömrüm güdaza gedər.

Sinəsi mərmərdir, sərvdir qamət,
Üzünü görməsəm, qopar qiyamət,
Oturub zülfündən etsəm hekayət,
Dərdim artar tuli-diraza gedər.

Sən gülsən, bülbül sev, xarı istəmə,
Hərgiz kamal istə, varı istəmə,
Meyl eylə Vaqifə, sarı istəmə,
Özü şahbaz olan şahbaza gedər.

*
* *

Günəş üzlü, xoş qılıqlı cavansan,
Qaşların bənzəyir hilalə, Yetər.
Niqab atıb sərxoş-sərxoş gəzəndə,
Oxşayırsan yorğun maralə, Yetər.

Sənsən mənim tubam, sərvim, şümşadım,
Qəmzəsi hərami, çeşmi cəlladım,
Dün gecə fələyə çıxdı fəryadım,
Rişmədi guşinə bu nalə, Yetər?

Nə gözəl yaraşıb al, yanağına,
Nazikdir, dəyməsin əl yanağına;
Zülfü buxağına, gül yanağına,
Nə bənəfşə bənzər, nə lalə, Yetər.

Mən bir qulam, canım oda salmışam,
Yaslanıban dost kuyində qalmışam,
Vaqif kimi molladan dərs almışam,
Gəl yetirsin səni kəmalə, Yetər.

*
* *

Yay qaş bucağında, al yanaq üstə
Nə xoş xumarlanır məstanə gözlər.
Sürməli kirpikdən oxlar çəkilib,
Eyləyib bağrımı nişanə gözlər.

Qəmzə peykanilə tökdü qanımı,
Xətalara saldı din-imanımı,
Əgri durdu, süzgün baxdı, canımı
Aldı o şux gözlər, amma nə gözlər.

Siması şəhlayi, tərhi badami,
Baxışı mehriban, özü hərami,
Quldur ona siyah zülfün təmami,
Ola bilməz belə şahanə gözlər.

Səmən iyli, səhabi zülf, ay qabaq,
Qönçə dəhan, dür diş, ərğəvan dodaq,
Münəvvər üz, lalə zənəx, tər buxaq,
Tamam bir yanədir, bir yanə gözlər.

Vaqif ki, düşübdür əqlü kamaldan,
Əksik olmaz başı qovğadan, qaldan,
Nə zülflərdən bilin, nə xəttü xaldan,
Eyləyibdir onu divanə gözlər.

*
* *

Ey maral baxışlı, sona sığallı,
Nə gözəldir səndə o qara tellər.
Kəmənd kimi tökülübdür gərdənə,
Dönübdür sərasər şahmara tellər.

Sənə sığal verib, əcəb tər düşüb,
Hörülüb qəddilən bərabər düşüb,
Sanasan mələkdən balü pər düşüb,
Düzülüb dalında qatara tellər.

Bənəfşədən tazə, sünbüldən gözəl,
Ötüb ucu düşüb o beldən gözəl,
Heç tel görməmişəm bu teldən gözəl,
Olmayıbdır belə aşkara tellər.

Sənə heyran olub xalqın çoxusu,
Görənlərin kəsilibdir yuxusu,
Müşkü ənbər kimi gəlir qoxusu,
Dönüb Çindən gələn əttara tellər.

Zülflərini çin-çin qoyub üzə sən,
Sallan sərxoş, seyrana çıx düzə sən!
Sən gərəkdir Vaqif ilən gəzəsən,
Görünməyə hərgiz əğyara tellər.

*
* *

O tubu baxışın yıxdı aləmi,
Xumar gözlərin nə qiyamət eylər.
Kəbəyi-kuyini görən kimsənə
Nə zaman qibləyi ziyarət eylər?

Durna telli, topğun tərlan cilvəli,
Görməmişəm sən tək nazlı-qəmzəli,
Sərasər yaxası qızıl düyməli,
Baxdıqca özünə fəxarət eylər.

Eyib yoxdur şövkətində, şanında,
Qaşü qabağında, həm dəhanında,
Şərt deyildir, yatıb-duram yanında,
Gendən baxmaq mənə kifayət eylər.

Vaqif baxar zülfi-pərişanına,
Tərk eylər məscidi, gələr yanına,
Sidqi-dildən canın qatsa canına,
Huriyü qılmana məlamət eylər.

*
* *

Yenə qəhri keçib xublar şahinin,
Bizdən lütfü şəfəqqəti kəsibdir.
Əvvəlki tək dəxi baxmaz üzümə,
Üz döndərib iltifatı kəsibdir.

Məndən küsüb, yalvarıram barışmaz,
Sinə açıb, qucaqlaşıb sarışmaz,
Gündəki tək gəlməz, deyib danışmaz,
Şirin-şirin hekayəti kəsibdir.

Mənə ümmid verib çəkmə qəm deməz,
Dərdlərinə dərman edərəm deməz,
Təklif edib bir ləbindən əm deməz,
Həm şəkəri, həm nəbatı kəsibdir.

Əyibdir qəddimi yay qaş qabaqda,
Gözüm qaldı zənəxdanda, buxaqda,
Səbrü qərarımı gülgəz yanaqda
Siyah zülfün o zülmatı kəsibdir.

Vaqifəm çox muştaqam bir nigara,
Neyləyim eyləməz dərdimə çara,
Heç bilmirəm nə olubdur bu yara,
Gülər üzü, xoş süfatı kəsibdir.

*
* *

Mən sənə olmuşam didar aşiqi
Sən üzünü bürüməyin nədəndir?
Şirin sözlərinin çox müştaqiyəm,
Danışmayıb kiriməyin nədəndir?

Əlin dalda tutub, başın yanında,
Hərgiz tel görünməz qaşın yanında
Mənim kimi bir sirdaşın yanında
Qayım-qayım sarınmağın nədəndir?

Eşqi gərək gözəl olan kimsənin,
Ta qılmaya tərkin nazü qəmzənin,
Yarlıqda ki, yoxdur xəyalın sənin,
Bəs dünyada yaranmağın nədəndir?

Gümüş kəmər bənd eyləmiş miyana,
Qurban olsun canım cana qıyana
Oturub-oturub yönü o yana,
Küsüb durub yeriməyin nədəndir?

Vaqifəm, əzəldən bir gövhər idim,
Saflıqda polada bərabər idim.
Ta ki, səni gördüm, mum tək əridim
Heç deməzsən əriməyin nədəndir?

*
* *

Əgər yarsan, gəl sarmaşaq qol-boyun,
Durub daldalardan baxmağın nədir?
Yar deyilsən, çək ayağın, geri dur,
Canımı odlara yaxmağın nədir?

Eşq sevdasına heç kəs pis deməz,
Məhəbbət yolundan ayaq kəs deməz,
Göz görməsə dəli könül istəməz,
Bəzənib qarşıma çıxmağın nədir?

Vaqifin bağrını qana döndərdin,
Səg rəqibi üstümüzə əndərdin,
Mənə gizlin bir nişanə göndərdin,
Aşkara başıma qaxmağın nədir?

*
* *

Ey Kəbəm, Kərbəlam, Məkkəm, Mədinəm,
Bir zaman kuyində ziyarətimdir.
Qiblə deyib, qaşlarına baş əymək –
Gecə-gündüz mənim ibadətimdir.

Hər nə desəm, sən incimə sözümdən,
Sərxoşunam, yox xəbərim özümdən,
Şol qamətin yayınanda gözümdən,
Sanasan ki, həşrü qiyamətimdir.

Bağlamışam din-imanı zülfünə,
Mənim kimi heyran hanı zülfünə,
Tapşırıb gedirəm canı zülfünə,
Yaxşı saxla, səndə əmanətimdir.

Sənsən mənim ayım, günüm, hilalım,
Dövlətim, iqbalım, cahım, cəlalım,
Gözəl üzün daim fikrü xəyalım,
Sözün dildə şirin hekayətimdir.

Sonalar xəcildir siyah telindən,
Tutilər lal olur şirin dilindən,
Şikəstə Vaqifəm, sənin əlindən
Hər kimə ki, yetsəm, şikayətimdir.

*
* *

Xublarda ki, zövqü səfa deyirlər, –
Fərbah gül əndamda, ağ bədəndədir.
Könül asayişi, canın rahəti
Gülgün zənəxdanda, tər zəğəndədir.

Bir yoğun baldırlı, yumuşaq dizli,
Bir sərxoş yerişli, məstanə gözlü,
Bir ayna qabaqlı, bir günəş üzlü
Gözəlin həsrəti, dərdi məndədir.

Əvvəl gözəllərdə gərəkdir çağlıq,
Ondan sonra ola sadəlik, ağlıq;
Nə ağzında yaşmaq, nə üzdə yaylıq, –
Çirkinlik üzünü bürüyəndədir.

Qaşilən, gözilən cigər qan olur,
Zülf sevəndə nə din, nə iman olur.
Can quşu xallarda bəndivan olur,
Dirlik zövqi-ləbdə, həm dəhəndədir.

Eybsiz gözəlin xoş olur xoyu,
Gizləmə cəmalı, qaməti, boyu.
Görəndə Vaqif tək xoş göftguyu,
Məhəbbət eylər ki, bu guyəndədir.

*
* *

Sevdiyim, ləblərin yaquta bənzər,
Sərasər dişlərin dürdanədəndir.
Sədəf dəhanından çıxan sözlərin
Hər biri bir qeyri xəzanədəndir.

Nədəndir sözümə cavab verməmək,
Həm camal gizləyib, üz göstərməmək.
Gecələr gözlərim xabı görməmək,
Ol siyah nərgisi-məstanədəndir.

Mən ha səni nuri-ilahi sannam,
Camalının şöləsinə dolannam,
Atəşinə mərdü mərdanə yannam,
Bu xasiyyət mənə pərvanədəndir.

Bir namə yazmışam can üzə-üzə,
Badi-səba, apar sən o gül üzə,
Soruşsa yar ki, bu kimdəndir bizə?
Söyləgilən: – Sizin divanədəndir.

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadan, nə şanədəndir.

Müştaqdır üzünə gözü Vaqifin,
Yolunda payəndaz üzü Vaqifin,
Sənsən fikri, zikri, sözü Vaqifin,
Qeyri söz yanında əfsanədəndir.

*
* *

Yasəmən tellərin, nərgiz gözlərin,
Mənimlə, gözəlim, çoxdan yağıdır.
İnsaf et, öldürmə günahsız qulu,
Əl-əldən üzülür, yaman çağıdır.

Kamallı gözəldə xəta kəm gərək,
Sevgi gərək, söhbət gərək, dəm gərək,
Aşiqə vəfalı bir həmdəm gərək,
Həmdəmsiz bal yesə, ona ağıdır.

Bahari-ömrünü versə də başa,
Aşiq məşuqədən usanmaz, haşa!
Fərhad Şirin üçün sığındı daşa,
Məcnunun ovlağı Leyli dağıdır.

Aşnasından üz çevirsə bir qafil,
Onda vəfa olmaz, onu yəqin bil.
Sona kəklik sara uysa neçə il,
Laçın qalxar yuvasını dağıdır.

Qışın şiddətindən çəkinməzsə yaz,
Çalxanmaz göllərdə nə ördək, nə qaz,
Vaqifin köksünə başdan çal-çarpaz
Çəkilib haçandan – canan dağıdır.

*
* *

Al geyinib çıxsan gülşən seyrinə,
Yığılı başına güllər dolanır.
Mahtab hüsnünə bəndə fərmandır,
Qulluğunda aylar, illər dolanır.

Görməmişəm sən tək bir mələkzada,
Dərdini çəkərəm həddən ziyada,
Kirpiklərin ucu düşəndə yada,
Bağrımın başında millər dolanır.

Mən Fərhadam, sən bir Şirin dəhansan,
Dərdin zahir, amma özün nəhansan,
Gözəllik babında şahi-cəhansan,
Eşiyində yüz min qullar dolanır.

Eyləyibsən məni eşqə giriftar,
Gündüzüm biqərar, gecələr bidar,
Rövzeyi-kuyində gəzəndə əğyar,
Çeşmim girdabında sellər dolanır.

Ləblərin bağrımı pürxun eyləmiş,
Axıtmış göz yaşım Ceyhun eyləmiş,
Həsrətin Vaqifi Məcnun eyləmiş,
Onun üçün gəzir çöllər dolanır.

*
* *

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügiylə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm dəxi qoymazlar kəndə.
Xalq batıbdır noğla, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcamalımız var.
Vaqif, öyünmə ki, kamalımız var,
Allaha şükür ki, kamal da yoxdur.

*
* *

Kür qırağının əcəb seyrəngahı var,
Yaşılbaş sonası, hayıf ki, yoxdur!
Ucu tər cığalı siyah tellərin
Hərdən tamaşası, hayıf ki, yoxdur!

Qış günü qışlağı Qıraqbasanın,
Gözüdür Aranın, cümlə-cahanın,
Belə gözəl yerin, gözəl məkanın
Bir gözəl obası, hayıf ki, yoxdur!

Çoxdur ağ bədənli, büllur buxaqlı,
Lalə zənəxdanlı, qönçə dodaqlı.
Amma şirin dilli, açıq qabaqlı,
Könül aşinası, hayıf ki, yoxdur!

Havasından torpağının, yerinin,
Dadızmaz dəhanın, ləbi-şirinin,
Pəri çoxdur, nə fayda heç birinin
Adamlıq ədası, hayıf ki, yoxdur!

Ucu əşrəfili, bulut kimi saç,
Dal gərdəndə hər hörüyü bir qulac,
Kələğayı əlvan, qəsabə qıyğac,
Altından cunası, hayıf ki, yoxdur!

Zər haşiyə al nimtənə üstündə,
Xallar üz yanında, çənə üstündə,
Buxağın altında, sinə üstündə,
Zülfün burulması, hayıf ki, yoxdur!

Laçın təki başda ala tomağa,
Yaşmağı tutmaya dişə, dodağa,
Cəllad kimi durub qabaq-qabağa
Baxıb can almağı, hayıf ki, yoxdur!

Çünki yorğunuyam mən bu yolların,
Qaydasını billəm hər üsulların,
Gümüş biləklərin, bəyaz qolların,
Sarı kəhrəbası, hayıf ki, yoxdur!

Ayna tutub hərdəm camal görməsi,
Zülfə, zənəxdana sığal verməsi,
Səhər ala gözün siyah sürməsi,
Əlinin hənası, hayıf ki, yoxdur!

Vaqif haqdan dilər lütfü kərəmlər,
Belə yerdə qalan, vallah, vərəmlər.
Yenə yada düşdü bizim sənəmlər.
Getməyin binası, hayıf ki, yoxdur!

*
* *

Səhər-səhər həsrət ilən gəzirdim,
Cüt qoşa nar gördüm iki sinədə.
Birisi qız idi, birisi gəlin,
Can qurban eylərəm ikisinə də.

Gəlin bulaqda əl, üzünü yuyur,
Qız deyir: gəl gedək, həriflər duyur,
Belə gözəl sevən əldənmi qoyur,
Can qurban eylərəm ikisinə də.

Gəlnin dodağıdır Təbrizin məti,
Əlli-altmış tümən qızın qiyməti,
Belə gözəl sevən neylər cənnəti,
Can qurban eylərəm ikisinə də.

Gəlinin yaxası polad iynəli,
Qızın yaxasıdır çarpaz düyməli.
İkisi də bir-birindən öyməli,
Can qurban eylərəm ikisinə də.

Kababım olaydı, közüm olaydı,
Yar yanında ötkün sözüm olaydı,
Vaqif deyir: iki gözüm olaydı,
Baxaydım bunların ikisinə də.

*
* *

Ey canım cəlladı, ömrüm yağısı,
Məgər səndə, zalım, din-iman yoxdur?
Gecə-gündüz həsrətini cəkməkdən
Üzülübdür, məndə dəxi can yoxdur.

Səg rəgibin bir daş düşsün başına,
Qoymaz ki, yar ilən olaq aşına,
Həqdir, yanan çoxdur eşq ataşına,
Mənim tək od tutub alışan yoxdur.

Ey qaşları hilal, yanaqları gül,
[Ey] zülfləri reyhan, xalları fülfül,
Aşığın öldürən birəhmü bidil,
Sənin tək aləmdə ev yıxan yoxdur!

Səni sevən olur həmişə dilşad,
Soyun adəmidir, cinsin pərizad,
Qamətin ər-ərdir, qolların şümşad,
Bu şənü şövkətdə hec insan yoxdur.

Vaqif, halın sitəmkara deməyə,
Yalvarıban vara-vara deməyə,
Bu xəstənin ərzin yara deməyə,
Məgər bu arada müsəlman yoxdur!

Vidadi

Oğlan, sən uşaqsan, cavansan hələ,
Yenicə cisminə düşüb vəlvələ,
Təzəcə dəyənək alıbsan ələ,
Qaim tut ki, nagah düşər, ağlarsan.

Vaqif

Bidəmaq olmaqdan nə düşər ələ,
Şükr eylə Allaha, gəz gülə-gülə!
Uşaq ha deyilsən tez-tez habelə
Könlünün şişəsi sınar, ağlarsan!

Vidadi

Uzaqdan bax, yaxşı fəhm et satirə,
Bu iş baxmaz heç könülə, xatirə,
Istər yüz il bu yollara qat zirə,
Bir gün yanar canü ciyər, ağlarsan!

Vaqif

Keçən işdən mərd igidlər pozulmaz,
Atalar deyibdir: “Tökülən dolmaz”.
Qatıq üçün qışda ağlamaq olmaz,
İnşaallah, gələr bahar, ağlarsan!

Vidadi

Dövlətindən yetdik nanü nəməyə,
Düşdük indi cadü qatıq yeməyə,
Söz ki çoxdur, yeri yoxdur deməyə,
Əgər bilsən, ey bixəbər, ağlarsan!
V a q i f

İç qatığı, ye darının cadını,
. . . . . . . . . . .
Neylərsən dünyanın dadlı zadını,
Sənə olur o zəhrimar, ağlarsan!

Vidadi

Ey mənə göstərən qatığı, cadı,
Onu yeyən tapar külli muradı,
Dünyanın sənə də ləzzəti, dadı,
Bir gün olar axır zəhər, ağlarsan!

Vaqif

Necə ki, dirisən, ölü deyilsən,
Qocalıban yaylar kimi əyilsən,
Padişahsan əgər özünü bilsən,
Neçin olub candan bezar, ağlarsan!

Vidadi

Elə ki, taxıldı burnuna çeşmək,
Qocalıq əl verib, dəxi nə şişmək...
Uşaqlar içinə düşər gülüşmək,
Sənin də acığın tutar, ağlarsan!

Vaqif

Yavuz çox qocalan bayatı sevər,
Gah öyünər, tək-tək özündən deyər,
Sən də yetişibsən o həddə məgər,
Beyninə bayatı uyar, ağlarsan?

Vidadi

Külli Qarabağın abi-həyatı,
Nərmi-nazik bayatıdır, bayatı,
Oxunur məclisdə xoş kəlimatı,
Ox kimi bağrını dələr, ağlarsan!

Vaqif

Müxəmməs deməyin seyrəklənibdir,
Bayatıda zehnin zirəklənibdir,
Qocalıbsan qəlbin köyrəklənibdir,
İşdən-gücdən olub bekar ağlarsan.

Vidadi

Gəl danışma müxəmməsdən, qəzəldən,
Şeri-həqiqətdən, mədhi-gözəldən,
Sənin ki, halını billəm əzəldən,
Elə deyib canan, dilbər, ağlarsan.

Vaqif

Yetmişdə ki, belə nəm gələ gözə,
Kəsməyə arasın, baxmaya sözə,
Ol zaman ki, yaşın yetişər yüzə
Gəl gör, onda nə bişümar ağlarsan.

Vidadi

Sarı çoban oğlu gəlsin yanına
Axund deyə canın qatsın canına,
Xanın şövkətinə, sənin şanına,
O yaxşı müxəmməs düzər, ağlarsan.

Vaqif

Nədəndir bənizin heç olmur duru,
Savılıb bostanın olubdur quru,
O zaman ki, sənə . . . . .
Gözlərin çanaqdan çıxar, ağlarsan.

Vidadi

Dərdlərinə dərman olmaz heç kəsin,
Əbubəkrə hərgiz yetişməz səsin,
Mitilin altında qalır nəfəsin,
Mürği-ruhin göyə uçar ağlarsan.

Vaqif

Bir gün çökər qabağına Əzrayıl,
Deyər, ey kor bəndə, qəflətdən ayıl,
Görərsən bir qərib şəklü şəmayil,
Ürəyinə qanlar damar, ağlarsan.

Vidadi

Əzrayıl ki, çəngəl sala canına,
Çevrilib baxarsan hər bir yanına,
O zamanda sənin ah-əfğanına,
Nə bir gəlin, nə qız yetər, ağlarsan!

Vaqif

Onun çəngəli ki, əzayə düşər,
Çaxnaşar cəsədin lərzayə düşər,
Tamam sümüklərin vay-vayə düşər,
Dirikən dərini soyar, ağlarsan.

Vidadi

Axirət sözünü salma yadına,
Dürüst deyil, mütləq, etiqadına,
Məhşər günü kimsə yetməz dadına,
Fəryadın fələyə çıxar, ağlarsan.

Vaqif

Yanarsan, təpədən çıxar tütünün,
Tutuşar boğazın, kəsilər ünün,
Hələ vardır bundan betər pis günün,
Üqbayə edəndə səfər ağlarsan.

Vidadi

Mömin olub qəlbin olsaydı səlim,
Bilərdin xudanın olduğun kərim,
Sənə kərəm eylər əzizü həkim,
Nə çəkərsən xovfü xətər, ağlarsan.

Vaqif

Çün gedərsən o qaranlıq dar yerə,
Qonşu olmaz, çağıranda səs verə,
Bir kimsə tapılmaz qapından girə,
Görərsən dörd tərəf divar, ağlarsan.

Vidadi

Möminəm, zikrimdir daim ilahi,
Uzaqdır könlümdən külli mənahi,
Əfv olur möminin cümlə günahi,
Sənin də könlündən keçər, ağlarsan.

Vaqif

Zahir olur iki şəxsi-qəzəbnak,
Əllərində şeşpər, çapikü çalak.
Onları görəndə zəhrin olur çak,
Qutun qurur, nitqin batar, ağlarsan.

Vidadi

Münkir sözü, sual sözü, sin sözü,
Söz bir gərək, nə danışmaq min sözü.
Dünya, axirətdən belə din sözü,
Əlin yoxdur, bəs müxtəsər, ağlarsan.

Vaqif

Bu yanından çıxar o zalım şeytan,
Su göstərər, səndən ta ala iman,
Nə Ömər tapılar, onda nə Osman,
Hər biri bir yanda batar, ağlarsan.

Vidadi

Məzarın, məhşərin həqdir cəhəti,
Məhrum qalmaz Məhəmmədin ümməti,
Sən ki, tərk edibsən tamam sünnəti,
Çox çəkərsən qəzəb, qəhər, ağlarsan.

Vaqif

Çünki işin çəp düşübdür əzəldən,
Fayda olmaz işlədiyin əməldən,
Mələk verər dəftərini sol əldən,
Günahını bir-bir sayar, ağlarsan.

Vidadi

Mələklər ki, gələr sahib izzətdən,
Ayıra mömini asi millətdən,
Görər ki, deyilsən əhli-sünnətdən,
Səni yolum-yolum yolar, ağlarsan.

Vaqif

O gündə ki, qaçar pədərdən püsər,
Gövdənə çulğaşar, ilan sərbəsər,
Su verməz içəsən saqiyi-kövsər,
Kəbab təki bağrın yanar, ağlarsan.

Vidadi

Əvvəl Bubəkrdir peyğəmbərə yar,
Ömərdir islamı eyləyən izhar,
Osmani-Zinnureyn, Heydəri-kərrar,
Olarlar saqiyi-kövsər, ağlarsan.

Vaqif

Çün töhmət edibsən o həştü çara,
Əlin necə yetər sənin onlara,
Qapılarda dolanarsan avara,
Gör başına gələr nələr, ağlarsan.

Vidadi

Əbubəkr, Ömər, Osmanü Əli,
Cümlə həştü çahar imami-vəli,
Neymanü şafei, Malik, Həmbəli,
Onları cəmiən əzər, ağlarsan.

Vaqif

Ol zaman ki, qaynar kəllədə beyin,
İmam əzəm danar sözün, hər şeyin,
Heç üzə mən baxa bilmənəm deyin,
Səni görcək gözün yumar, ağlarsan.

Vidadi

Allahın ki, heç çəkməzsən minnətin,
Tərk edibsən peyğəmbərin sünnətin,
Nə görərsən məsumların hörmətin,
Əgər ağlamazsan, əgər ağlarsan.

Vaqif
Həştü çahar çün halını duyarlar,
Sanma səni öz halına qoyarlar,
Əvvəl onlar səni diri soyarlar,
Sümüyünü ta gömərlər, ağlarsan.

Vidadi

O zaman ki, məşhər xalqı durarlar,
Divan olub sorğu-sual sorarlar,
Əgər səni bu məzhəbdə görərlər,
Yerbəyer budayıb əzər, ağlarsan.

Vaqif

Demə ki, dadıma yetər Maliki,
Dərdə düşər səndən betər Maliki,
Qaçar ilim-ilim itər Maliki,
Yaşınıb bir yerdə yatar, ağlarsan.

Vidadi

Həşrədək qalarsan ahü-zar ilən,
Həsrətilən, çox-çox intizar ilən,
Kələz ilən, əqrəb ilən, mar ilən,
Ağzınadək qəbrin dolar, ağlarsan.

Vaqif

Çox kimsələr qıl körpüdən asılar,
Həmbəlinin qaraulu basılar,
Qorxusundan bir bucağa qısılar,
Dinə bilməz mat-mat baxar, ağlarsan.

Vidadi

Həsən Kaşinin ta başın kəsərlər,
Kəsib onu cəhənnəmdən asarlar,
Qızdırıb-qızdırıb oda basarlar,
Onu görüb əqlin çaşar, ağlarsan.

Vaqif

Şafeinin olmaz o qədər suçu,
Əvvəldən axıra ayrıdır köçü,
Gələr fəriştələr amma bu üçü
Tutar bir-birinə çaxar, ağlarsan.

Vidadi

Şafeini imamlardan ayırma,
Əmmə xanı görüb riya qayırma,
Bu sözləri ləzgi içrə buyurma,
Səni qalmıqlara satar, ağlarsan.

Vaqif

Qəbirdən ki, çıxıb gedərsən Şama,
O günlərin dönər toya, bayrama,
Əlin yetməz peyğəmbərə, imama,
Qiyamət başına qopar, ağlarsan.

Vidadi

Qapılarda çox toxuna-toxuna,
Ömərdən, Osmandan, gəzmə saxına,
Olarsız ki, heç qoymazlar yaxına,
Döyə-döyə öldürərlər, ağlarsan.

Vaqif

Əqlin olsun, on iki imama inan,
Fayda verməz sonra olmaq peşiman,
Yəqin bil ki, qurulacaqdır mizan,
Əməlin qarşında durar, ağlarsan.

Vidadi

İmamlar ha deyil sənin yoldaşın,
Olsaydı gözündə olardı yaşın,
Sən əqldə vardır neçə qardaşın,
Olur olsun, sən müqərrər ağlarsan.

Vaqif

Vəqtkən dəli olma, gəl eşit məndən,
Gəzmə yalvar-yapış onlara gendən,
Amma qorxun olsun Əbülhəsəndən,
Səni əzim-əzim əzər, ağlarsan.

Vidadi

Qulluq etməyibsən Əbülhəsənə,
Gələ o günündə yar ola sənə,
Yetişməz dadına heç bir kimsənə,
Qalarsan nailac, naçar, ağlarsan.

Vaqif

Axır sənin necə haldır bu halın,
Hansı mətləbdədir fikrü xəyalın?
Vədə günü atın, qoyunun, malın,
Əgər doğmaz, əgər doğar ağlarsan.

Vidadi

Çün sevməzsən atı, qoyunu, malı,
Eşitməzsən, hərgiz bu qalmağalı,
Bəs nədir yığıbsan neçə əyalı,
Doğmaz şad olarsan, doğar, ağlarsan.

Vaqif

Heç axtarma şahi-Heydər Əlini,
İmamü hümami, tamam vəlini,
Yığ başına təpik atan dəlini,
Olar ki, bir-birin qırar, ağlarsan.

Vidadi

Tanırsan Şəmkirli dəli qazını,
Həsəni-Kaşini, Nəsir Tusini,
Tərki-sünnət olan tamam asini,
Görərsən duzəxə girər, ağlarsan.

Vaqif

İmam ki, iraqdır etiqadından,
Tamam bildiklərin çıxar yadından,
O zaman çəkilər ah nihadından,
Fəryadın fələyə çıxar, ağlarsan.

Vidadi

Olan peyğəmbərin doğru rahında,
Xuda saxlar onu öz pənahında,
Səni hər kim görər həq dərgahında,
Qatar qabağına qovar, ağlarsan.

Vaqif

Başına cəm olub, əqlin yığılmaz,
O səbəbdən dərdin, qəmin dağılmaz,
Sənin malın buzov salıb, sağılmaz,
Hər kəs inəyini sağar, ağlarsan.

Vidadi

Şeytan ki, dünyada aldadır kimi,
Xoş gəlir o kəsə dünyanın dəmi.
Çox yığma başına hurü sənəmi,
Qafil, özgələrə gedər, ağlarsan.

Vaqif

Cəhənnəmə getsin gedən həmdəmlər,
Olar üçün çəkmə sən bunca qəmlər,
Keçən günləri ki, indi bu dəmlər,
Dəli könül əbəs anar, ağlarsan.

Vidadi

Göz neçün ağlayıb tökməsin nəmi,
Heyvan ha deyil ki, çəkməyə qəmi,
Əqlin olsa, anıb yarı, həmdəmi,
Leylü nahar, şamü səhər, ağlarsan.

Vaqif

Həqqi-peyğəmbərə, o çariyarə,
Tamam imamlara həştü çaharə,
Uymasan, yanarsan duzəxdə narə,
Kimsə olmaz sənə yavər, ağlarsan.

Vidadi

Nahaq yerə əhli-həqqə dəyənlər,
Peyğəmbərin doğru yolun əyənlər,
Azğın-azğın çariyarə söyənlər,
Çaqqal tək duzəxdə ular, ağlarsan.

Vaqif

Nə yaradır ürəyinin yarası,
Bu vaxtadək olmayıbdır çarası?
Uzun illər kəsilməyib arası,
Şamü səhər, leylü nahar ağlarsan?

Vidadi

Bir göz ki, ağlamaz, həm tökməz yaşı,
Əlbəttə, xalidir beyini, başı,
Olmasa, yad eylər yarü yoldaşı,
Hərdəm ki, yadına düşər, ağlarsan.

Vaqif

O qədər dolandın sağdan və soldan,
Dövləti, xanı da çıxardın yoldan,
Qoymadın ki, verə parçadan, puldan,
Səni xələt əhli tutar, ağlarsan.

Vidadi

Çox bulanma bu dünyanın qanına,
Vəfa yoxdur sultanına, xanına,
Danasını bir gün qoymaz yanına,
Bizim inək kimi təpər, ağlarsan.

Vaqif

Dünya işində ki, qoçaqsan, qoçaq,
Ölüdən qıvraqsan, diridən qaçaq,
Bir gün sağ olursan, yeddi gün naçaq,
Övrətlər bağrını üzər, ağlarsan.

Vidadi

Səni qamışlıqda yaşıran fələk,
Əqlini başından çaşıran fələk,
Meyxanədən tez-tez düşürən fələk,
Belə qoymaz bir gün sürər, ağlarsan.

Vaqif

Öləndən sonra o güruhi-nacı,
Məzarına salmaz sayə qıyqacı,
Özündən irəli çürük ağacı
Ağzının üstündən çəkər, ağlarsan.

Vidadi

Allah rəbbindir Məhəmməd Şəfi,
Külli halə oldur əlimü səmi,
Deyilmi yəğfiruzzünubi cəmi,
O gündə gözlərin görər, ağlarsan.

Vaqif

Minərsən qatırı, sürə bilməzsən,
Yolun altın, üstün görə bilməzsən,
Xan gələr, yerindən dura bilməzsən,
Qələbəyi qolundan tutar, ağlarsan.

Vidadi

Ağqız oğlu Piri dünya qardaşın,
Hatəm xan ağadır sində yoldaşın,
Sarı çoban oğlu gözəl dindaşın,
Nə çəkərsən sən dərdü sər, ağlarsan.

Vaqif

Soruşarlar səndən neçə xəbəri,
Üstünə çəkərlər tiğü təbəri,
Söylərsən sözünü dəli, sərsəri,
Hər biri bir yandan budar, ağlarsan.

Vidadi

Olunandan sonra sorğu-sualın,
Yenə ağlamaqdan olmaz məcalın,
Savılmaz başından bu qalmağalın,
Hər ləhzədə həzar-həzar, ağlarsan.

Vaqif

Münkir-nəkir necə olsa ötüşər,
Sor ki, sonra işin hara yetişər,
Divar gələr bir-birinə bitişər,
Səni oyum-oyum oyar, ağlarsan.

Vidadi

Oxuram, gər cürmim var isə əzim,
İnnəlləhə hüvvət təvvabür-rəhim,
Həqqin olduğuna qəniyü-kərim,
Əzəl etməyibsən bavər, ağlarsan.

Vaqif

Qıl körpüdən ta ki, sürçər ayağın,
Cəhənnəm xovfindən yarılır yağın,
Qorxma, yenə Əli olar dayağın,
Əgər anıb həştü çahar ağlarsan.

Vidadi

Şiə xalqı tamam dolar duzəxə,
Qalarlar duzəxdə od yaxa-yaxa,
Mahaldır ki, biri duzəxdən çıxa,
Cümlə olar zirü zəbər, ağlarsan.

Vaqif

Vaqif, gərçi əzabı var dünyanın,
Sən neçün xovfini çəkərsən, anın,
Tutubsan ətəyin Şahi-mərdanın,
O gülər – gülərsən, ağlar – ağlarsan.

Vidadi

Əhli-sünnət vəl-cəmaət peyvəstə,
Gedərlər cənnətə dəstəbədəstə,
O gündə şad olar Vidadi xəstə,
Səni yanlış görüb gülər, ağlarsan.

# QEYDLƏR

## İZAHLAR

### GƏL, EY QƏLƏBƏYİ MƏHƏMMƏDXAN BƏY

Bu şeri Vaqif 1795-ci ildə yazmışdır. Ağa Məhəmməd Şah Qacar Şuşanı mühasirə etdiyi zaman Şuşaya gələn müəyyən yolların müdafiəsini İbrahim xan ayrı-ayrı adamlara tapşırmışdı.

Vaqif bu şeri Şuşa müdafiəsində iştirak edən qalabəyi Məhəmmədxana yazıb onun mühasirə günlərində dövləti vəzifədən çox, öz şəxsi təsərrüfatı ilə, öz şəxsi işləri ilə məşğul olmasından bəhs edir.

Məhəmmədxan bəyin dilindən Vaqifin müasiri və dostu Ağqız oğlu Piri şairə aşağıdakı cavabı göndərmişdir:

Gəl, ey Vaqif, Məhəmmədxan bəy ilə,
Əvvəlki aşnalıq, aranı saxla!
Allahın əmrilə danış hədisdən,
Sidq ilə kitabı, Quranı saxla!

Gəldi o vəsfi-hal yetişdi mənə,
. . . . . . . . . . .
Bu şeytan libası yaraşmır sənə,
Axundsan, çiynində boranı saxla!

Əyilibdir qəddin, ağarıb yalın,
Hərəm ilə necə keçər əhvalın?
Əsgərandan aşağı ötməsin yolun,
Sən elə cəhd elə, oranı saxla!

Az qalıbdır yaşın yetirə yüzə,
İnnən belə bəsdir, dəm vermə sözə,
Qılıncı, tüfəngi, bağışla bizə,
Kağız, qələm, davat, Quranı saxla!

Ağqız oğlu Pirini sən də çox əkmə,
Torpaqlı damına taxtapuş tökmə,
Şatırını burax, qəlyanı çəkmə,
Əzbərində yasin, duanı saxla!

Bu cavabdan Əsgəran tərəfin müdafiəsinin Vaqifə tapşırıldığını təxmin etmək olur.

**BİR ZAMAN HAVADA QANAD SAXLAYIN**

Vaqif "Durnalar" rədifli şerini Vidadinin aşağıdakı qoşmasına cavab yazmışdır:

Qatar-qatar olub qalxıb havaya,
Nə çıxıbsız asimana, durnalar?
Qərib-qərib, qəmgin-qəmgin ötərsiz,
Üz tutubsuz nə məkana, durnalar!

Təsbih kimi qatarınız düzərsiz,
Havalanıb ərş üzündə süzərsiz,
Gah olur ki, danə-xörə gəzərsiz,
Gah düşərsiz pərişana, durnalar!

Ərz eləyim, bu sözümün sağıdır,
Yollarınız həramıdır, yağıdır.
Şahin şunqar sürbənizi dağıdır,
Boyanarsız qızıl qana, durnalar!

Əzəl başdan Bəsrə, Bağdad eliniz,
Bəylər üçün ərməğandır teliniz,
Oxuduqca şirin-şirin diliniz,
Bağrım olur şana-şana, durnalar!

Bir baş çəkin dərdiməndin halına,
Ərzə yazsın, qələm alsın əlinə,
Vidadi xəstədən Bağdad elinə,
Siz yetirin bir nişana, durnalar!

XIX əsrin məşhur şairi Qasım bəy Zakir də Bakıda sürgündə olduğu zaman hər iki şairin əsərinə cavab olaraq durnalar mövzusunda şeir yazmışdır.

**AÇIQBAŞDA OLSA ƏGƏR BİR DİLBƏR**

Vaqif bu şeri Vidadi II Iraklinin sarayında olduğu zaman ona göndərmişdir. Şeir 1857-ci ildə M.F.Axundov tərəfindən rus dilinə tərcümə olunub, Tiflisdə nəşr edilən "Zurna" adlı məcmuədə çap olunmuşdur.

## BAYRAM OLDU HEÇ BİLMIRƏM NEYLƏYİM

Bu şeir Vaqifin ilk qoşmalarındandır. Şair bu əsəri hələ Şuşa şəhərinə gəlməmiş, Tərtərbasarda məktəbdarlıq etdiyi illərdə yazmışdır. Şeirdən, hələ onun subay olduğu aydınlaşır. Şair öz yoxsul həyatından danışır.

## SİYAHTEL GÖRMƏDİM KÜR QIRAĞINDA
## və
## KÜR QIRAĞININ ƏCƏB SEYRANGAHI VAR

Vaqif bu iki şeri İbrahim xanla birlikdə Kür Qırağı kəndlərində olduğu zaman yazmışdır. Rəvayətə görə xan öz atlıları ilə Kür qırağına gəlib, bir neçə müddət burada qalır. Xanın və atlıların yemək-içməyini təmin etməkdə çətinlik çəkən əhali təngə gəlir, ağsaqqallar Vaqifə müraciət edərək, xanı buradan aparmağı ondan xahiş edirlər. Vaqif bu iki qoşmanı yazıb xanəndəyə verir və məclisdə oxutdurur. Şairin getmək arzusunu duyan İbrahim xan atlılara Şuşaya qayıtmaq əmrini verir.

## VİDADİDƏN GƏLƏN KAĞIZ MƏNİ FƏRXƏNDƏHAL ETDİ

Vaqif bu qəzəli, Vidadinin aşağıdakı şerinə cavab olaraq yazmışdır:

Deyibsiz yəni gəlləm, gəldi bir belə xəbər, Vaqif,
Xilaf idi bu sözlər ya peşimandır məgər Vaqif?

Bilirdim mən, fələk verməz visalə çox da üz, amma
Bizi saldın əzabi-intizarə, müxtəsər, Vaqif.

Bugün-danla demə, dövran deyildir bir qərar üzrə,
Sən ondan ta olunca vaqif, ol səndən keçər, Vaqif!

Macalın var ikən ol yarü həmdərdi, güzar eylə.
Könül qəmdən açar, yaxşı olur seyrü səfər, Vaqif!

Vətən yad eyləməzsən gər, tutalım, könlünüz quşdur,
Məgər qəti rəhimdən eyləməzsiz bir xəbər, Vaqif!

Fələk, bərəksi-dövran olduğundan bir nişandır bu,
Vidadi xəstə tək düşmüş vətəndən dərbədər, Vaqif!

Vaqifin cavab şerinə Vidadi aşağıdakı qəzəl ilə cavab vermişdir:

Bilirsiz, Vaqifə kim, könlümüz didarə çoxdandır,
Nə çarə, eyləməz dövran visalə çarə çoxdandır.

Pərişandır könül zülfi pərişanlar havasında,
Bu sövdadə olubdur mürği-dil avarə çoxdandır.

Qərəz, canana mətləb can isə, inkarımız yoxdur,
Verib can-baş yolunda durmuşuq iqrarə çoxdandır.

Vidadi xəstə kim, düşmüş səadətlər sücudundan,
Vəli Sənani-dil ta bağlanıb zünnarə çoxdandır.

## MEHRİBANLIQ GÖRMƏYİB BİR MƏHLİQADƏN KÜSMÜŞƏM

Bu qəzəl bir cüngdə 6 beytdir. 5-ci beyt budur:

Dost desə gəl əm ləbimdən dərdinə dərman olur
Əmmənəm tobələr olsun ol dəvadən küsmüşəm.

## KİM Kİ, SEVDAYİ-SƏRİ-ZÜLFİ-PƏRİŞANƏ DÜŞƏR

Vaqif bu şeri Vidadiyə yazmışdır. Vidadi Tiflisdə II Iraklinin sarayında nə münasibətlə isə həbsə alınır və sonradan azad edilir. Vidadi azad olduqdan sonra Vaqif bu şeri yazıb dostuna təskinlik verir. Vidadi həmin şerə aşağıdakı cavabı yazır:

Hər səhər bad əsər, zülfi-pərişanə dəyər,
Toxunar sərvə gahi, gah gülüstanə dəyər.

Olmasa qabil əyər dəhr cəfa verməz ona,
Təm bihəzzət olanda neçə dəndanə dəyər.

Şəm gər yansa səvadi-şəb üçün, heyf olmaz,
Şöləsi çünki onun arizi-canana dəyər.

Səhldir şiddəti-zindan düşəsən mərd əlinə,
Leyk bidad işi min möhnəti zindanə dəyər.

Söhbəti-nakəsü namərd həmin söhbət imiş,
Tut ki, bir mərd ətəyin dövləti-xaqana dəyər.

Sən ki, bir mərdin ucundan nə cəfa çəkdin isə,
Vəsli-didarı onun rəhməti-ğüfrana dəyər.

Mən ki, meydani-bəla içrə sərim top edərəm,
Ta düşər əldən-ələ, axırı çovkanə dəyər.

Canımı atəşi-qürbətdə belə yandıraram,
Necə şəmə dolanıb hər gecə pərvanə dəyər.

Nə qədər olsa qoca, gərçi, Vidadi xəstə,
Yenə Vaqif kimi, əlbəttə, yüz oğlana dəyər.

Bu şerin dördüncü beytindən aydındır ki, Vidadi Vaqifin də bir zaman bir mərdin ucundan həbsə alındığını ona xatırladır.

## QARABAĞ İÇRƏ BİR ŞAİR KƏLIMÜLLA MUSADİR

Bu şeri Vaqif Şuşa şəhərində məktəbdar olduğu zaman hələ saraydan kənar yoxsul bir həyat keçirdiyi illərdə yazmışdır. Burada şair Qarabağda Cavanşir xalqı içərisində şerin çox sevildiyindən, özünün çətin həyat keçirməsindən bəhs edir və göstərir ki: Qarabağda şairi möcüzə yaradan Musa kimi qarşılayırlar. Cavanşir əhli bayatıya hünər kimi baxır. Cavanşir nəsli qələm qədrini bəni-Israil, Musanın atdığı zaman əjdahaya çevrilən əsasını qiymətləndirdiyi kimi qiymətləndirir.

Ürəyi işıqlı adamlar ömürlərini nadanlar içində keçirməlidir, çünki çıraq qaranlıq dekabr gecələrində daha artıq hökmranlıq edər. Şair ümidvardır ki, bu qara günlər axıra qədər belə davam etməsin. Vaqif özünün Şuşa şəhərində yaşamasını məlin çaxmaq daşı içərisində olmasına bənzədir.

## EY VİDADİ, GƏRDİŞİ-DÖVRANİ-KƏCRƏFTARƏ BAX

Vaqif bu şeri 1797-ci ildə Ağa Məhəmməd şah Qacar öldürüldükdən sonra yazıb dostu Vidadiyə göndərmişdir. Burada şair, Vidadini zəmanədə baş verən hadisələrdən ibrət almağa çağırır. Zülm əhlinin bərbad olmasından, gecə xalqa qiblə olan bir çırağın (şaha iranlıların qibleyi-aləm deyə müraciət etmələrinə işarədir) sübh sönməsindən, qürurla dolu olan şah başının təpiklər

altına düşməsindən bəhs edir. Şair şahın onu cəza ilə öldürmək üçün əmr verməsini xatırlayıb özünün qurtarmasını dəmirçinin zalım şahın cəzasından qurtamasına bənzədir:

Qurtaran əndişədən ahəngəri-biçarəni,
Şah üçün ol midbəri-təbdil olan mismara bax! – deyir.

Bu beyt bir rəvayətin bədii ifadəsidir. Rəvayət belədir: müəyyən məqsəd üçün dəmirçini öldürtmək istəyən bir şah ona qəsdən bir gecədə qırx min at mıxı hazırlamağı əmr edir. Dəmirçi səhərə qədər yatmır, ölüm saatını gözləyir.

Səhər tezdən şahın adamları qapını döyürlər. Ancaq onlar at mıxı yox, dəmirçini cəzalandırmaq üçün yox, gecə ölmüş şahın tabutu üçün dörd mismark hazırlamağı xahiş edirlər.

## DƏHRDƏ OLDU MƏNƏ DİLDARÜ DİLBƏR BİR TÜFƏNG

Vaqif bu müxəmməsi Şəki xanı Hüseyn xan Müştaqa yazıb ondan yaxşı bir tüfəng istəmişdir. Hüseyn xan öz sarayında yaşayan şair Rafei ilə Vaqifə qızıl suyuna tutulmuş bir tüfənglə bərabər aşağıdakı şeri də göndərmişdir:

Gəlmiş ol alicənabın qasidi istər tüfəng,
Ey gözüm, nəzzarə qıl, bax hər yana, axtar tüfəng,
Eyləsin tap kim, görənlər söyləsin behtər tüfəng,
Kamil olmuş cövhəri üstündə nəqşi-zər tüfəng,
Neylər, ayə, bilməzəm, ya rəb, bu şuxü şər tüfəng?

Yox ikən zatı cahanda, qıldı Əflatun onu,
Gör nələr saldı xəlayiq içrə, tutsun xun onu.
Hər gələnlər ixtiraən qıldılar əfzun onu,
Eyləmişlər qətli-nəfs etməkdən ötrü çün onu,
Onun üçün novhə salmış aləmə, ağlar tüfəng.

Yayı təşbih etdilər xubruların əbrusuna,
Tiri-müjganə, dönüm ey gözlərin cadusuna,
Xəncər ilə nizə kimdir, düşələr qayğusuna,
Çərxə də dəysə başı, dəyməz onun pabusuna,
Hansı sim əndamlının bir üzvünə bənzər tüfəng?

Sən Qarabağ içrə qurmuşsan tələb meydanını,
Tutmusan dildə olan vədü vəfa nizamını.
Görməyibsən əsbi-ehsanın məgər cövlanını

Bir tüfəngin bu qədər sən çəkmisən hicranını,
Eyləsin təslimi-Rafe çeşmi ya bərsər tüfəng.

Şerinə təhsin ki, yetməz heç bir əşar ona,
Hər kimin var isə həddi, söyləsin göftar ona,
Kimsə ləb tərpətməsin kim, gəlməz istifsar ona,
Eybdir Müştaqdan bu sözləri izhar ona,
Tutmasın nəzmi rəkakət var isə kəmtər, tüfəng.

**QIŞ GÜNÜ ÇÜNKİ DÖNƏR ŞOL CƏNNƏTÜL-MƏVAYƏ KÜRK**

Vaqif bu şeri Şəki xanı Hüseyn xanın ona kürk hədiyyə göndərməsi münasibətilə yazmışdır.

**MƏN CAHAN MÜLKÜNDƏ MÜTLƏQ DOĞRU HALƏT GÖRMƏDİM**

Bu müxəmməs Vaqifin son əsərlərindəndir. Ağa Məhəmməd şah Qacarın Şuşa şəhərində öldürülməsindən sonra xanlığı əlinə alan Məhəmməd xan Cavanşirin rəftarından və ümumiyyətlə, feodal hakimlərin zülm və əzabından təngə gəlmiş şair bu əsərində öz dövrünün ictimai dərdlərindən bəhs etmişdir.

**VALİNİN ÇEŞMİ-ÇIRAĞI, VƏH, NƏ TÜRFƏ CAN İMİŞ**

Vaqif bu şeri II Irakli ilə dostluq əlaqələri yaratmaq münasibətilə Tiflisə getdiyi zaman orada yazmışdır. Müxəmməs XVIII əsrdə yazılmış bir cüngdən götürülmüşdür.

**VƏH, BU BAĞIN NƏ ƏCƏB SƏRVI-DİLARALARI VAR!**

Bu şeri də Vaqif Tiflisdə olduğu zaman yazmışdır. O, Vali deyə işarə edir. Müxəmməsdə Iraklinin oğlu Eulon tərif edilir.

**NAZ İLƏ TA OL BÜTİ-ZİBA KƏLİSADAN ÇIXAR**

Bu müxəmməs də Tiflisdə yazılmışdır.

## BİR NİMTƏNƏ KİM, TA OLA ZƏRBƏFTÜ NİKUTƏR

Vaqifin bu müstəzadına oğlu Əli ağa Alim belə cavab vermişdir:
Ey xahiş edən nimtənə pür zivərü zinət
Qıldın bizə fərman.
Axır gərək, əlbəttə, bu nimtənəyə nisbət,
Bir məhvəşi-dövran.
Yəni ki, ola böylə libası geyən övrət
Sər dəftəri-xuban.
Əyninə onun eylə yaraşa yeni xələt,
Görən ola heyran.
Bir vaxt çəkib nazilə sərvi-səhi-qamət,
Olanda xuraman,
Kim görsə deyə kim, nə əcayib, nə qiyamət,
Olum ona qurban!
Hər ləhzə qədəm yerə basanda, qoya minnət,
Ta ki, edə cövlan.
Eylə ki, qabaqda otura, eyləyə söhbət,
Valeh ola insan.
Sözü bütün ola, edə hər əhdicə biət,
Sındırmaya peyman.
Hal əhlinə eylə gözəli eyliyə qismət,
Ol qadiri-sübhan.
Başdan ayağa geydiyi əyninə yaraşa,
Ziybasına hərdəm.
Əlvan bəzənib naz ilə şal sarıya başa,
Bağlıya belə həm.
Əsbabi-mütəllasına göz baxa tamaşa,
Heyran ola adəm.
Hər ziynət edəndə, girə bir tərz qumaşa,
Dibaçədən əzəm.
Hər bir görəni eylə sala dağ ilə daşa,
Məcnun ola adəm.
Ol Leylisifət baxmaya bu gözdəki yaşa,
Rəhm etməyə bir dəm.
Zülfi siyəhi gərdənə sarmaşə, dolana,
Zəncirlənə möhkəm.
Bir seyl kimi eylə ki, girdab ola daşa,
Gözdən gedə çün nəm.
Gər olmasa, öz bəxti ilə gedə savaşa,
Ondan ola dərhəm.
Düşsə o zaman çünki ələ kəştiyi-nüsrət,
Tufan ola tufan.

Peyda şəvəd ər misli-çənin dilbəri-məhru,
Andəm şəvəd əhsən.
Ba ziynətü ba surətü ba ruyi-səmənbu
Məhbubi-müzəyyən.
Ba şövkətü ba izzətü ba xələtü niyku,
Ba zibi-müəyyən.
Yarəb bə ki, qismət şodə in şuxi-mələkxu,
Zahir gün bir mən.
Xoş başəd əgər hali-kəsi ki, şəbn ba u,
Ta sübh dəmidən,
Mixabəd bər bəstəri-pür gəştə zi pərqu,
Mibaşədü yektən.
Peyda şəvəd ər misli-çənin dilbəri-məhru,
Ey arifi-pürfən,
Bayəd berəvi bəhri hisuləş to behərsu
Ba əclü dəvidən,
Migir zi hər şəhriyü hər mənzilü hər ku,
Gər beşnəvi əz mən.
Məqdur şəvəd bəlkə tora in məhi-tələt,
Əz şəfqəti-yəzdan.
Hər kimin əlinə düşə bu vəsfdə dilbər,
Sala bir otağa.
Bir ləhzə onunla otura, yəni bərabər,
Qabaq-qabağa.
Ondan dəxi dolanıb onun başına yeksər,
Duruban ayağa.
Necə dolanır hər gecə ta sübh müqərrər,
Pərvanə çirağa.
Göysünə basıb, eyləyə sədrinə müsəddər,
Alıb qucağa.
Ol al rüxündən ala həm busə mükərrər,
Gög düşə yanağa.
Bir dəm görəsən naz qılıb oldu mükəddər,
Irişdi damağa.
Tərh eyləyibən aləmə həm ol pəri peykər,
Üz tuta qırağa.
Yalvarıban edəsən ona çoxluca minnət,
Ta kim, ola xəndan.
Alim, bu söz ilə elədim fəhmini izhar,
Qıldım çü hesabı.
Bilsin bu xəlayiq, deyirəm mən dəxi əşar,
Həm böylə cavabı.
Ol Vaqifin, əlbəttə, bu sözdən mənə zinhar,
Tutmasın itabı.

Onun sözünə qarşı deməyə nə hədim var,
Açman bu hicabı.
Odur bu cahanda, bəli hər elmə xəbərdar,
Yoxdur dəxi babı.
Mən həm bilirəm, oxumuşam dərs ilə təkrar
Quranı kitabı.
Kəs ataya söz qaytara məhşər günü qəhhar
Çox verər əzabı.
Xanın ki, əgər lütfü ola bəndəyə bir bar,
Dildən aça babı.

## VİDADİ İLƏ MÜŞAİRƏ

Bu deyişmədən sonra Vidadi Vaqifə aşağıdakı ixtisarla verdiyimiz şeri göndərmişdir.

Vaqif, nə tez sənəmlərdən əl çəkdin,
Birin bir inəyə qiymət eylərsən,
Hələ sonra keçiyə də enərsən,
Alsa müştəriyə minnət eylərsən.

Demədimmi alma ağ dəyənəyi,
Danadan, buzovdan etmə hənəyi,
İndi nə çox istəyibsən inəyi,
Hələ sonra daha şiddət eylərsən.

Dovtələb olubsan, gedibsən xandan,
Ölüncə çıxmanam ta gülüstandan,
İnşaallah çalışsan, habelə candan,
Hər nə desən bir aqibət eylərsən.

Bir igidsən, işlərində daim ol,
Demənəm ki, qəflət eylə, naim ol,
Xan buyuran qulluqlarda qaim ol,
Gör düşmənə nə həqarət eylərsən.

Əgər Allah xana verə nüsrətlər,
Zaye olmaz heç çəkdiyin zəhmətlər,
Başa gəlir eylədiyin niyyətlər,
Gər sidq ilə nəngü qeyrət eylərsən.

Quşçu Namazəli yeyib-yatmasın,
Daim sözün məsləhətə qatmasın,

Çox da özün hər meydana atmasın,
Qafil o igidi xiffət eylərsən.

Bizim Abdullahın vardır qədəmi,
Onun da ha imdi gəlibdir dəmi,
Yenə qoymaz o Gəncədə adəmi,
Əgər ki, sən bir işarət eylərsən.

Baqqal ilən Əli müştağındadır,
Molla Səfərəli fərağındadır,
Xeyrin olsun hər kəs yığnağındadır,
Onlar ilən zövqü işrət eylərsən.

Biz də təşrif buyurmuşduq bağacan,
Eşitdik gəldiyin Nəsib ağadan.
Mən ha bilməz idim ta bu çağacan,
İndi bildim hünər, cürət eylərsən.

Bu şeirdən aydınlaşır ki, Vidadi Qarabağda yaşadığı zaman xanla bərabər Gülüstana getmiş, Vaqif isə şəhərdə dövlət işləri ilə məşğul olmuşdur. Şeirdən Vaqifin eyni zamanda Şuşada təmirat işləri ilə məşğul olduğu da aydınlaşır.

## TARİXİ ƏFSANƏVİ VƏ COĞRAFİ ADLAR

**Açıqbaş** – Gürcüstan.

Ağa Məhəmməd xan – Ağa Məhəmməd şah Qacar – Qacar sülaləsinin ilk hökmdarlarındandır. 1795-ci ildə Şuşanı mühasirə etmiş, ala bilməmişdir.

Həmin il Tiflis şəhərini dağıtmışdır. 1797-ci ildə Qarabağda aclıq olmasından istifadə edərək, Şuşa şəhərini istila etmiş və Vaqifi həbsə aldırmışdır. Vaqif mühakimə ediləcək günün gecəsi Ağa Məhəmməd şah öz yatağında öldürüldüyündən şair həbsdən azad olunmuşdur.

**Ağqız oğlu Piri** – Vaqif və Vidadinin müasirlərindəndir. Heca vəzni ilə yazılmış şeirləri var. Əsərləri toplanılıb çap edilməmişdir.

**Bəni-İsrail** – qədim yəhudi qovmunun adıdır.

**Bubəkr** – bax: Əbu Bəkr.

**Cami** – (Əbdürrəhman Cami) – XV əsrdə yaşamış məşhur alim, şairdir.

Nizaminin “Xəmsə”si təsirilə “Həft övrəng” adlı poemalar məcmuəsi və bir sıra elmi əsərləri vardır.

**Cavad –** Qarabağ hökmdarı İbrahim xanın oğlu.

**Cavanşir** – Qarabağda bir nəslin adıdır. İbrahim xan bu nəsildəndir.

**Cəmşid** – İranın əfsanəvi hökmdarlarındandır. Şeirdə qüdrətli hökmdar mənasında işlənilir.

**Çaryar** – Məhəmməddən sonra xəlifə olan Əbu Bəkr, Ömər, Osman və Əli.

**Dara** – Həxəmənilər sülaləsinin son hökmdarıdır. Eramızdan əvvəl IV əsrdə Makedoniyalı Iskəndər tərəfindən öldürülmüşdür. Ədəbiyyatda qüdrətli hökmdar mənasında da işlənir.c

**Əbu Bəkr** – Məhəmməddən sonra birinci xəlifə.

**Əbülhəsən** – Həsənin atası deməkdir. Dördüncü xəlifə Əliyə işarədir.

**Əhli-sünnət** – Məhəmməddən sonra Əbu Bəkr, Ömər, Osman və Əlini xəlifə hesab edən müsəlmanlar.

**Əmmə xan** – XVIII əsrdə Bəlakən xanı olmuşdur. Qarabağ hökmdarı İbrahim xanın qaynıdır.

**Ərəstu** – Aristotel, məşhur yunan filosofu.

**Fərhad** – Nizaminin “Xosrov və Şirin” poemasının qəhrəmanlarındandır. Şeirdə fədakar aşiq mənasında, eyni zamanda qüdrət, qüvvət rəmzi mənasında işlədilir.

**Gülşa** – Məsihinin “Vərqa və Gülşa” poeması qəhrəmanlarındandır. Şeirdə gözəl sevgili, vəfalı məşuqə mənasında işlədilir.

**Hafiz** – Şəmsəddin Məhəmməd Hafizi Şirazi (1307-1388). Fars ədəbiyyatında böyük qəzəl ustadı kimi məşhurdur.

**Heydər** – Dördüncü xəlifə Əlinin ləqəblərindəndir.

**Həcər, həcərül-əsvəd** – qara daş deməkdir. Vaxtilə Məkkə şəhərinə düşmüş meteoritdir. Müqəddəs hesab olunur. Şeirdə gözəlin xalına bənzədilir.

**Hənbəl** – Əhməd ibn Hənbəl-hənbəli məzhəbinin banisidir.

**Həsən Kaşi** – XV əsrdə yaşamış fars şairidir. Əlini və imamları mədh edən şeirləri ilə məşhurdur. Vidadi onu sünnülük əleyhdarı olduğu üçün tənqid edir.

**Həştü çar** – səkkiz və dörd, yəni on iki deməkdir. Şiələrin müqəddəs saydığı on iki imama işarədir.

**Hətəmxan ağa** – Vaqifin müasirlərindəndir.

**Xızr** – dini əfsanələrdə dirilik suyunu içib əbədi yaşayan və darda qalanlara kömək edən əfsanəvi bir şəxsiyyətdir. Xalq ədəbiyyatında Xıdır İlyas, Xıdır Nəbi adları ilə də məşhurdur.

**İbrahim xan** – XVIII əsrdə Qarabağın xanı olmuşdur (1760-1806). Atası Pənah xandan sonra ölkəni idarə etmişdir. Iran təsirindən qurtarmaq üçün Gürcüstan və Rusiya ilə ittifaq bağlamış, 1805-ci ildə Rusiya himayəsini qəbul etmişdir. Vaqif onun sarayında eşik ağası vəzifəsində çalışmışdır.

**İmami əzəm** – İslam hənəfi məzhəbinin banisi Neman ibn Sabit əbu Hənifənin adlarındandır.

**İskəndər** – Nizaminin "Iskəndərnamə" poemasının qəhrəmanı. Şerdə qüdrətli hökmdar mənasında işlənir.

**Kabil** – Əfqanıstanın mərkəzi.

**Kəbə** – Məkkə şəhərində müsəlman məbədi.

**Kəlimülla** – Musanın ləqəbi.

**Kövsər** – Dini əsatirə görə cənnətdə bir bulaq adı.

**Qarun** – din tarixində dövləti ilə məşhur olan xəsis bir adam kimi təsvir edilir. Ədəbiyyatda xəsislik və zənginlik timsalı olaraq işlədilir. MəxzəniQarun – yəni Qarun xəzinəsi.

**Qeysər** – Sezar; Rum və yunan hökmdarlarının ünvanı.

**Qıraqbasan** – Kür çayının sahilləri.

**Quşçu Namazəli** – Vidadinin müasirlərindəndir.

**Leyli** – Nizaminin "Leyli və Məcnun" poeması qəhrəmanlarındandır. Şeirdə gözəl sevgili, vəfalı məşuqə mənasında işlədilir.

**Ləmbəran** – Qarabağda kənd adıdır.

**Malik** – Əbu Əbdullah ibn Üns XVIII əsrdə yaşamışdır. Maliki məzhəbinin banisidir.

**Məcnun** – "Leyli və Məcnun" poemasının qəhrəmanıdır. Şeirdə həqiqi, vəfalı, sadiq və hərarətlə sevən aşiq mənasında işlənir.

**Mədinə** – Ərəbistanda şəhər adıdır. Vaqifin arvadının da adı Mədinə imiş.

**Məhəmməd** – (Məhəmməd bəy Cavanşir) İbrahim xanın qardaşı oğlu idi. Ağa Məhəmməd şah Qacar Şuşa şəhərini aldığı zaman İbrahim xan öz ailəsi ilə bərabər Bəlakənə qaçmışdı. Ağa Məhəmməd şah Şuşada öldürüldükdə, xanın uzaqda olmasından istifadə edən Məhəmməd bəy Cavanşir xanlığı əlinə almışdır. O, əmisinin yaxın adamlarını ortadan götürmək istəmiş və buna görə də Vaqifi oğlu Əli ağa ilə birlikdə öldürtmüşdür. İbrahim xan gəldikdən sonra Şəkiyə qaçan Məhəmməd bəy, nəhayət, Şirvan xanı Səlim xan tərəfindən öldürülmüşdür.

**Məhəmmədxan bəy** – Vaqifin müasirlərindəndir. Şuşa xanlığında qalabəyi vəzifəsində işləyirdi.

**Məkkə** – Ərəbistanda şəhər adıdır.

**"Məsnəvi"** – Cəlaləddin Ruminin əsəridir.

**Müştaq** – Şəki xanı Hüseyn xanın şeirdə işlətdiyi təxəllüsdür. Hüseyn
xan Vaqifin dostu olmuş, ona tüfəng və kürk hədiyyə göndərmişdir.

**Neman** – Islamda hənəfi məzhəbinin banisi. Neman ibn Sabit əbu Hənifə.

**Ona imami**-əzəm də deyilir.

**Nəsiri Tusi** – XIV əsrdə yaşamış məşhur münəccim Nəsirəddin Tusi.

**Osman** – Osmani-zinnur – Məhəmməddən sonra üçüncü xəlifə.

**Ömər** – Məhəmməddən sonra ikinci xəlifə.

**Salahlı** – Qazaxda kənd adıdır.

**Sarı Çoban oğlu** – Vaqifin dostlarındandır.

**Sənan** – Şeyx Sənan. Əfsanəyə görə gürcü qızını sevdiyindən müsəlman ikən dönüb xristianlığı qəbul etmiş, otuz il donuz otardıqdan sonra sevgilisinə çatmadığı üçün məhv olmuşdur. Şeirdə məhəbbət uğrunda hər şeydən keçməyə hazır aşiq mənasında işlədilir.

**Şafei** – Imam Əli Əbdullah Məhəmməd VIII əsrdə yaşamışdır. İslamda Şafei adlanan məzhəbin əsasını qoymuşdur.

**Şahi-Mərdan** – dördüncü xəlifə Əlinin ləqəblərindəndir.

**Şəkər** – Nizaminin "Xosrov və Şirin" əsərində Xosrovun sevdiyi gözəl qadın. Ədəbiyyatda gözəl məşuqə mənasında işlədilir.

**Şiə** – tərəfdar deməkdir. Əlini və onun nəslindən olanları Məhəmmədin canişini hesab edib Əbu Bəkr, Ömər və Osmanı qəsbkar adlandıran müsəlmanlar.

**Şirin** – Nizaminin "Xosrov və Şirin" poemasının qəhrəmanlarındandır. Şeirdə gözəl və fədakar məşuqə mənasında işlədilir.

**Şişə** – Şuşa – XVIII əsrdə Pənah xan tərəfindən əsası qoyulmuş bu şəhər bir zamanlar Pənahabad adlanırmış.

**Valiyi-Gürcüstan** – Gürcüstan hökmdarı II Irakli.

**Vərq**a – XVII əsrdə yaşamış Azərbaycan şairi Məsihinin "Vərqa və Gülşa" poemasının qəhrəmanlarındandır. Şeirdə igid sevgili, vəfalı aşiq mənasında işlədilir.

V**idadi** – Molla Vəli Vidadi (1707-1807). Məşhur Azərbaycan şairi, Vaqifin yaxın dostudur. Bir müddət Qarabağ xanlığında yaşamış, Gürcüstan hökmdarı II Iraklinin sarayında olmuşdur.

**Yusif** (Yusifi-Kənan) – Firdovsi və Cami kimi şairlərin "Yusif və Züleyxa" adlı poemalarının qəhrəmanı. Gözəlliyi ucundan çoxlu iztirab çəkdiyi göstərilən Yusifin adı şeirdə gözəllik rəmzi kimi işlənir.

**Zəm-zəm quyusu** – Məkkə şəhərində Kəbə yaxınlığında olan bir quyudur, müqəddəs sayılır. Şərq şerində gözəlin ağzı ona bənzədilir.

**Züleyxa** – Şərq ədəbiyyatında "Yusif və Züleyxa" poemalarında Misir hökmdarının arvadı olaraq göstərilir. Onun Yusifi sevməsi, ona böhtan atması, zindana saldırması və nəhayət, onunla evlənməsi haqqında müxtəlif rəvayətlər vardır. Şeirdə gözəl məşuqə mənasında işlənir.

**Zülmət** – Nizaminin "İskəndərnamə" əsərində və xalq rəvayətlərində abi-həyat, dirilik suyu adlandırılan əfsanəvi çeşmənin olduğu qaranlıq aləm.

**LÜĞƏT**

**A**

*Abi-rəvan* – axar su
*Afəti-bəhr* – zəmanənin bəlası
*Ağuştə* – bulaşmış, bələşmiş
*Ahən* – dəmir
*Ahəngər* – dəmirçi
*Alinəsəb* – yüksək nəsildən olan
*Amac* – hədəf, nişanə
*Ara* – bəzəyən, zinətləndirən
*Arayiş* – zinət, bəzək-düzək
*Arəstə* – bəzənmiş, zinətlənmiş; hazır mənasında da işlədilir
*Asar* – əsərlər; əlamətlər; yadigarlar
*Aşüftə* – pərişan
*Atəşi-suzan* – yanar od

**B**

*Badü bərf* – külək və qar
*Bala* – yüksək; ucaboy, qədd, qamət
*Bar* – yük
*Barani* – yağmurluq, yağış yağan zaman geyilən libas
*Bari-möhnət* – dərd yükü
*Bavər etmək* – inanmaq
*Behtər* – daha yaxşı, çox yaxşı
*Beyzə* – yumurta
*Bədəl* – əvəz
*Bəqa* – əbədi
*Bən* – xal
*Bəng* – tiryək
*Bərf* – qar
*Bəsa* – çox
*Bəstə* – bağlı
*Bətn* – qarın
*Bəzbənd* – (“bazubənd” sözündən) –bilərzik
*Bəzl* – bağışlamaq
*Bəzm* – yığıncaq, məclis
*Bidad* – zalimlik
*Bidar* – oyaq
*Bikman* – şübhəsiz, şəksiz
*Bilə* – ilə

*Biləsincə* – arxasınca
*Bim* – qorxu
*Biməğz* – beyinsiz; ağılsız
*Binaguş* – qulağın sırğa taxılan yeri
*Bipərva* – qorxmaz
*Bisat* – fərş; döşənmiş yer
*Bu, buy* – qoxu
*Buta* – nişan, hədəf
*Büğz* – kin, düşmənçilik
*Bürqə* – üz örtüyü, niqab
*Büryan* – qızartma
*Büzğalə* – oğlaq

**C**

*Cahanara* – dünyanı bəzəyən (günəş mənasında işlənmişdir)
*Cam* – qədəh
*Came* – böyük məscid
*Canfəza* – can bağışlayan, can verən
*Canmürğü* – can quşu, ruh
*Cəbin* – alın
*Cifə* – cəmdək
*Cila* – parlaqlıq
*Cina*n – cənnət
*Cöv*r – zülm
*Cövşən* – dəmir halqalardan
hörülmüş dava paltarı
*Cud* – əliaçıqlıq, səxavət
*Cuş* – qaynamaq
*Cürə* – udum, içim
*Cürm* – günah
*Cürmi-kəbir* – böyük günah
*Cüstücü* – axtarış

**Ç**

*Çah* – quyu
*Çak* – parçalanmış
*Çakər* – qul
*Çalak* – diribaş
*Çaşt* – günorta vaxtı yeyilən yemək
*Çəng* – əl, pəncə; çalğı aləti
*Çərxi-çənbər* – dolanan çarx

*Çərxi-xəzra* – yaşıl göylər
*Çiz* – şey, zad

**D**

*Dal* – "D" hərfi ərəb əlifbasında yazıldığından bükük belə oxşadılır
*Dam* – tələ, tor
*Damu* – cəhənnəm
*Dari-fəna* – fəna evi, dünya
*Dər* – qapı
*Dəndan* – diş
*Dəstar* – çalma
*Dəstəri-əhmər* – qırmızı çalma
*Dəstur* – tərz, üsul, qayda
*Dəşnə* – xəncər
*Dibapuş* – ipək geyinən
*Didar* – görüş
*Dimaği-pürqürur* – məğrur beyin
*Dinlənmək* – dincəlmək, ruhlanmaq,
canlanmaq
*Dud* – tüstü
*Düxtər* – qız
*Düta* – iki dənə

**E**

*Eyd* – bayram
*Eyn* – göz

**Ə**

*Əblə* – ala-bula
*Əbrişim* – ipək
*Əbru* – qaş
*Əbus* – qaraqabaq
*Əbusən qəmtərir* – tutqun, qaşqabaqlı
*Əbyaz* – ağ
*Əflak* – fələklər, göylər
*Əfsər* – tac
*Əfşan* – saçan
*Əfzun* – artıq
*Əxtər* – ulduz
*Əhkam* – hökmlər

*Əqəl* – az
*Əlhan* – səslər
*Əltaf* – lütflər
*Əkbər* – ən böyük
*Əknun* – indi
*Əmmarə* – insanı pisliklərə məcbur edən meyl
*Əmvac* – mövclər, dalğalar, ləpələr
*Əndişə* – fikir, xəyal
*Ənvər* – nurlu, işıqlı
*Ərğüvan* – qırmızı çiçək adıdır
*Ərməğan* – hədiyyə, töhfə, sovqat
*Ərus* – gəlin
*Əsləhə* – silahlar
*Əştan* – susuz
*Əsayi-əjdəhapeykər* – əjdaha şəkilli əsa
*Əşk* – göz yaşı
*Ətvar* – tövrlər, hərəkətlər
*Ətvəl* – uzun
*Əzruzi-əzəl* – əvvəl gündən
*Əzvac* – zövcələr, arvadlar

**F**

*Fel* – iş
*Fəhmidə* – anlaqlı
*Fəraq* – ayrılıq
*Fəramuş* – unutmaq
*Fərbeh* – kök
*Fərda* – sabah
*Fərxəndəha*l – şad
*Fəriştə* – mələk
*Fəsli-şita* – qış fəsli
*Firib* – aldatmaq

**G**

*Gərd* – toz
*Gərdə*n – boyun
*Gərdiş* – dolanmaq, gəzmək
*Gərm* – isti
*Gəştə çıxmaq* – seyrə çıxmaq
*Gəz* – dəfə
*Gəzəl* – nar qabığı

*Giriban* – yaxa
*Geysu* – saç
*Göftar* – danışmaq
*Guş* – qulaq
*Guyəndə* – şair; natiq
*Gülbün* – gül ağacı
*Güli-həmra* – qızıl gül
G*ünəşas*a – günəş kimi

**H**

*Həbib* – istəkli; dost
*Həcərül əsvəd* – qara daş
*Hicab* – pərdə
*Hinduxal* – qara xal
*Hübab* – köpük
*Hüccac* – hacılar

**X**

*Xab* – yuxu
*Xak* – torpaq
*Xah* – istər
*Xahan* – istəyən
*Xamə* – qələm
*Xar* – tikan
*Xas* – seçilmiş
*Xatəm* – üzük
*Xədəng* – ox
*Xəndan* – gülən
*Xəndə* – gülüş
*Xərmöhrə* – eşşək muncuğu
*Xəzra* – yaşıl
*Xiş*m – acıq, qəzəb
*Xişmə* – acıqlanmaq, qəzəblənmək
*Xoşəlha*n – xoş səsli
*Xoşxan* – gözəl səsli
*Xotkar* – Türkiyə sultanı
*Xub* – yaxşı, gözəl
*Xuban* – gözəllər
*Xun* – qan
*Xunxa*r – qaniçən
*Xüld* – cənnət

*Xülq* – xasiyyət

İ

*İbrani-dil* – şirin dil
İ*hanət* – təhqir etmək
*İmruz* – bu gün
*İmbisa*t – açılmaq; fərəhlənmək
*İnayət* – yardım, kömək
*İntiqal* – yerini dəyişmək; keçmək
*İsnə əşər* – on iki (məzhəb adıdır)
*İstifsor* – sual
*İstiğna* – naz
*İstimal*ət – təsəlli vermək
*İym*a – işarə, him

**K**

*Kan* – mədən
*Kəbir* – böyük
*Kəmtər* – alçaq
*Kərbas* – bez, ağ
*Kəzzab* – yalançı
*Kişvər* – ölkə
*Kizb* – yalan
*Köşk* – kaşanə
*Kutah* – qısa, gödək
*Kuy* – küçə
*Kuzəkar* – səhəng, bardaq qayıran
*Küreyi-atəşsuzan* – yanar od kürəsi

**Q**

*Qalü bəla* – əzəl gün
*Qarıçqay* – qızılquş
*Qəbqəb* – buxaq
*Qəhr* – qəzəb
*Qəmtərir* – qatı, sərt
*Qəsabə* – qədimdə qadınlara məxsus baş geyimi
*Qətreyi-əşk* – göz yaşı damlası
*Qövl* – söz, qövlü sadiq ola – sözü düz ola
*Qübari-tirə* – qara torpaq
*Qüllab* – çəngəl

**L**

*Lalərüx* – lalə üzlü
*Leşkər* – qoşun
*Ləali* – incilər, mirvarilər
*Ləbxəndə* – dodağı gülüşlü
*Ləhin* – səs
*Liqa* – üz
*Lölö* – mirvari, inci

**M**

*Mah* – ay
*Mahtaban* – işıqlı, parlaq ay
*Mahvə*ş – ay kimi
*Manənd* – oxşar
*Mədar* – vəsilə
*Mədələt* – ədalət
*Mə*h – ay
*Məhbub*i-müntəxəb – seçilmiş gözəl
*Məhtab* – ay işığı
*Məxmur* – xumarlanmış, süzgün
*Məxzən* – xəzinə
*Məqal* – danışıq
*Məlalət* – yorğunluq, düşkünlük
*Məlbusə* – libas, paltar
*Mələkasa* – mələyə bənzəyən
*Mənquşə* – nəqş olunmuş
*Mərdud* – qovulmuş
*Mərqəd* – qəbr
*Mətlə* – şerin ilk beyti
*Məva* – düşərgə, mənzil, məskən
*Məzəllət* – zəlillik; zillət
*Mişkin* – qara; müşklü
*Mövc* – ləpə, dalğa
M*övla* – ağa
*Müxlis* – yaxın dost
*Müjgan* – kirpiklər
*Müləhhəm* – ətli
*Müntəxəb* – seçilmiş
*Müsəffa* – saflaşdırılmış
*Müsəvvər* – təsvir edilmiş, rəsm

olunmuş
*Müstəhsən* – bəyənilmiş
*Müşəvvəş* – halı pərişan; təşvişli
*Mütəhəyyir* – heyran olan; heyrətə düşmüş
*Mütərra* – təravətli, rövnəqli

**N**

*Nadidə* – görünməmiş
*Naim* – yatan, qafil
*Nakəs* – alçaq
*Nayab* – tapılmayan
*Nəxl* – ağac
*Nəvaxan* – hava ilə oxuyan
*Nigah* – baxış
*Nisa* – qadın

**P**

*Pamal* – paymal – tapdalanmış, ayaq altında qalmış
*Pay* – ayaq
*Paybənd* – ayağı bağlı; əngəl
*Peyğam* – xəbər, sifariş
*Peyk* – çakər, qasid, muştuluqçu
*Peykan* – oxun ucuna taxılan dəmir
*Peykər* – surət, üz, çöhrə; gözəl
*Peymanə* – içki içilən qab, sağər,
qədəh
*Peyvəst*ə – daim, həmişə; bir-birinə bağlı
*Pərtöv* – parlaqlıq, aydın işıq
*Pərü-bal* – qol-qanad
*Pərvizə* – parlaqlıq
*Piçüta*b – iztirab, təlaş; qıvrım
*Pirahə*n – köynək
*Pirayə* – zinət, rövnəq
*Purqu* – qu tükü
*Pustin* – kürk, içi dərili bürüncək
*Puşak – örtük, geyim*
*Pür* – dolu
*Püsər* – oğul

**R**

*Raz* – sirr
*Razi-dil* – ürək sirri
*Rəhgüzar* – keçid, yol
*Rəxt* – paltar
*Rək* – damar
*Rənc* – əziyyət
*Rəvan* – gedən, axan; ruh
*Riştə* – tel
*Rud* – çay
*Ruyi*-zəmin – yer üzü
*Rüxsa*r – üz

**S**

Sahir – cadugər, sehr eləyən
*Said* – bilək
S*aq* – baldır
*Savad* – qara; qaralıq
*Sayə* – kölgə
*Sayru* – xəstə
*Sevb* – paltar, əlbəsə
*Sədr* – sinə
*Səfid* – ağ
*Səg* – it, köpək
*Səlasil* – zəncirlər
*Səm* – eşitmə
*Səmən* – yasəmən gülü
*Səngdil* – daş ürəkli
*Səngi-xara* – çaxmaq daşı
*Sərəfraz* – başı uca
*Sərəndaz* – bəzəkli baş örtüyü
*Sərgəştə* – avara, sərgərdan
*Sərir* – taxt
*Səri-sərdar* – sərdarın başı
*Səriri-hüsn* – gözəllik taxtı
*Sərvər* – başçı
*Sib* – alma
*Sim* – gümüş
*Simi-müsəffa* – saf gümüş
*Simin* – gümüşə tutulmuş
*Sirat* – yol
*Siyasət* – cəza
*Soy* – cins

S*u* – tərəf
*Sürbə* – quşların sürüsü, qatarı
*Sürur* – şadlıq
**Ş**

*Şanəvə*ş – daraq kimi
*Şatır* – atın yanında piyada gedən adam
*Şeyd*a – vurğun
*Şəb – gecə*
*Şəhdi-müsəffa* – saf bal
*Şəkkərfəşa*n – şəkərsaçan; şirin danışıqlı
*Şəmi-suzan* – yanan şam
*Şəms* – günəş
*Şəmsü-qəmər* – ay və günəş
*Şərm* – həya
*Şiri-jəyan* – qızmış şir
*Şita* – qış

**T**

*Taban* – işıqlı
*Tabdar* – parlaq; qıvrım; hərarətli
T*abəndə* – parlaq
*Taci-zər* – qızıl tac
*Tar* – qaranlıq
*Təbər* – balta
*Təcdid* – yenidən, yenidən başlamaq
*Təərrü*z – dolaşmaq, söz atmaq; hücum
*Təlafi* – qaytarış, əvəz
*Tərə*b – şadlıq
*Tərrar* – cibkəsən, oğru
*Tərsa* – xristian
T*əsxi*r – istila
*Təşnə* – susuz
*Tiğ* – qılınc
*Tovfir* – çoxaltmaq, artırmaq
*Tuşə* – azuqə
*Türa*bi – torpaq rəngli

**Ü**

*Üftadə* – düşkün
*Üşmək* – xəz bürüncək

*Üzma* – böyük qadın

**V**

*Vəch* – üz
*Vərd* – gül
*Vəsmə* – qaşa çəkilən rəng

**Z**

*Zaidən* – doğmaq
*Zəban* – dil
*Zəxm* – yara
*Zərrin* – güləbatınlı, zərli
*Ziba* – göyçək
*Zişt* – çirkin, pis
*Zivər* – zinət, bəzək
*Zud* – tez
*Zülfi-pürtab* – qıvrım saç

## MÜNDƏRİCAT



## QOŞMALAR

## TƏCNİSLƏR

## QƏZƏLLƏR



## MÜXƏMMƏSLƏR

## MÜSTƏZADLAR



## MÜƏŞŞƏRLƏR

## QEYDLƏR

